# Molla Nəsrəddin



# ملّا نصرالدّین

Hazırladı: Cavid Ağa

حاضرلادی: جاوید آغا

2 rəcəb 1331 **Səkkizinci il** 25мая 1913 г.

# ملا نصر الدين

№16 Qiymәti 12 qәpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 16

*Möhtərəm ruhanilər! Sizin borçunuzdur ki, ittihadi-islam üçün başqa ölkələrdən gələnləri tutub dövlətə təslim edəsiniz!*






*Vallah biz təkçə bunu tapmışıq, bunun da dilini qanmırıq ki, bəlkə siz deyən adam elə budur.*

**Adres:** *Tiflis, Davidov küçəsi nömrə 24.*
**Адресь:** *Тифлись, Давидовская, 24.*
**Teleqram üçün:** *Tiflis, "Molla Nəsrəddin".*
**Для телеграмм:** *Тифлись, "Молла Насреддинь".*
***Подписная цена:***
***На годь - 6 руб.***
***6 месяц - 3 р. 50 к.***
***3 месяц - 2 р.***
***1 месяц - 40 к.***
Adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

**Qafqazda və Rusiyada**
**12 aylığı - 6 manat**

"------------------------" 6 aylığı - 3 manat yarım
"------------------------" 3 aylığı - 2 manat
"------------------------" 1 aylığı - 40 qəpik
*Əcnəbi məmləkətlərdə 12 aylığı - 7 manat*
"------------------------" 6 aylığı - 4 manat

***Tək nüxsəsi idarəmizdə 10 qəpik, özgə şəhərlərdə 12 qəpik.***

## İDARƏDƏN

Möhtərəm müştərilərimizə lazım bilirik elan edək ki, hər kəsin abunə vaxtı qurtarıbsa gərək pul göndərsin, əks surətdə onun jurnalını dayandıracağıq və habelə o şəxslərdən ki, məcmuəmiz onlara nisiyə göndərilir xahiş edirik ki, pulların tezlik ilə idarəyə yetirsinlər və bir də o ağalara ki bildir, inişil idarə tərəfindən vəkil olub jurnal satıb idarəyə indiyədək borclu qalıbdılar, təvəqqə olunur ki, hesabımızı tamam-kamal göndərib bizi başqa bir vəsilələrə müraciət etməyə vadar etməsinlər.

*İXTAR. Hüseyn Çavid "Ana" adlı əsəri basılıb təzə çapdan çıxdı. Kitabxanamızda satılır. Tiflis, İttifaq.*

**ELAN.**
Alıram əntiqə pullar,
üstündə insan şəkli olsun.
*Тифлись, Бебутовская 34.*
*Верхн. Этажь.*
*Роттер*



## İFTİRA

Mən cox təccüb edirəm bu musurman qardaşlara ki, bu qədər bir-birlərinə zülüm, ədavət, şeytənət, xəyanət elədikləri bəs deyil, indi də, başlayıblar bir-birlərinə iftira deməyi və böhtan atmağı.

Fazil Məcusinin rəyinə görə ki, Töhfənin aşağısında yazıbdır: Əlbuhtənu aqbəhu min əməlilmüslimin, yəni böhtan bir şəxsin haqqında demək müsəlman işindən də pisraqdır. Gərək insan iftiradan, böhtandan uzaq olsun.

A kişi, insaf elə bu yekəlikdə də iş olar ki, bir sarsaq Bəhlulun birisi Bakıda götürüb Kaşi kimi bir kişiyə böhtan atsın və yazsın ki, Allah eləməmiş guya Hacı Kaşi bir gecə piyan halında gəlib Naci Şeyxəli karvansarasının dalandarını ki, bir qoca kişidir, qaranlıqda qucaqlayıb, hər çe piş ayed xoş ayəd deyibdir?!

Dilim lal olsun, bu sözləri danışanda adamın tükləri biz-biz olur və min dəfə istiğfar edir. Həcərüləsvəd kimi müqəddəs bir daşa sürtülən dodaq araq-çaxıra dəyərmi? Demirəm bəlkə Hacının

ticarətinin pərtliyi və islam aləminin indiki vəzi-həvasi pərişan edib özlüyündən çıxartmış imiş, yoxsa haşa və kəlla ki, Hacıya bu cür isnad vermək cayiz olsun?!!

Bu cür böhtanlardan bizə gündə yüz yerdən yazırlar və həmişə biz idarə tərəfindən o şəxsə cavab veririk ki, istiğfar ediniz ki, sizin günahınızın odu bizi də yandırar, qorxun Allahdan və cəhən-nəm əzabından. O cümlədən birisi axmaq-axmaq götürüb Bakıdan bizə gör nə yazır, gör sən Allah bir əlcən uşaq buna inana bilər?!!

Məsələn yazır ki, mən Tiflisdən gəlib cıxdım Yeldöyən şəhərinə və burada mənə hamama getmək lazım oldu. Vəqti ki, getdim hamama və mənim Tiflisdən gəlmiş bir şair olduğumu duydular, mənim "Molla Nəsrəddin" müxbirlərindən hesab edib o qədər vurdular ki, enim ilə uzunum bərabər oldu və indi neçə vaxtdır həkimə düşmüşəm, yorğan döşəkdə yatıram və işi vermişəm ədliyyə divanxanasına və və və…

Vaqiən bu böhtana genə başqa şəhərin haqqında desəydilər bir növ inanmaq olardı. Amma Bakının barəsində doğrusu mənim ağlım kəsmir ki, Bakı kimi dinc və rahat yerdə belə bir yırtıcılıq əmələ gəlsin. Bakılıya hərçənd ki, belə-belə isnadlar verirlər və deyirlər ki, bakılı deyilən insan o qədər bəddava və adamxordu ki, nəinki bir Bakıda hətta hər il yayda Mədən sularına yaylağa gedəndə orada qoçubazlıq eləyir və dəstə saxlayır və hətta bir il Yesentukidə bakılılar parkın icində on minlər ilə adamın gözünün qabağında dəstə-dəstə olub atışıblar da. Amma mən imanım, mən dinim bunlar deyil əgər iftira və yalan sözlər. Bakılılar hər il Petiqoriskiyə gedirlər ki, oranın müsəlmanları üçün qəbiristan yeri hasarlatsınlar və məscid tikdirsinlər, hərçənd ki, keşiş ağa bu işlərə maneçilik eləyir nəinki atışmağa. Amma nə dəxili var, insan həmişə gərək ehtiyat ilə dolansın və yarağın əldən qoymasın, cox da ki, oranın adamları fəqir uruslardı və kənardan gələnlər də hamısı əyan-əşraf və nücəbadırlar. Bakılı niyə qoçusuz şəhərindən qırağa cıxır?

Bu cür böhtanlardan hər yerdə hər, şəhərdə var. Görürsən Naxcıvandan götürüb yazırlar ki, burdan bir nəfər əyan gedib Culfaya özünə fərş almağa və bir dana fərş bir munasib qiymətə bir şəxsdən alıbdır bu şərtilə ki, pulunu sonra bir əlahiddə adam ilə göndərib malını həman pul gətirənə versinlər. İttifaqən həman sövda olunan yerdə Naxçıvanın mömin bəylərindən dəxi bir nəfər var imiş və bu fərşin ucuz və munasib giymətə alınmağına həsəd aparırmış. Fərş alan çıxıb Naxçıvana gedəndən bir gün sonra həmin cənab mömin bəy özü fərşin pulunu aparıb fərş satan Kablayı əmiyə verir ki, dünənki şəxs göndəribdir və fərşi özü götürüb aparır Naxcıvana salır otağına, başlayır onun üstündə pak-pakizə namazın qılıb və ibadətinə məşğul olmağı. Daha əsl fərş alan nə qədər dad-fəryad edir, axırı bir yana catmır. Deyir özüm almışam ki, özüm almışam.

İndi sən Allah, insaf elə, biz gələk belə-belə böhtanlara inanaq və belə-belə iftiralara qulaq asaq özümüzü salaq cəhənnəmə. Heç gör momin belə iş görər?!!

Pərvərdigara, pənah aparıram sənə daha nə qaldı insanın qulağı eşitməsin?!!

Əla lənətullahi alə qauməzzalimin.

Va səyə aləmul-ləzinə zaləmu ey munqalibin yənqalibun.

*Sarsaqqulubəy*

## SƏBRİBƏYZADƏYƏ BİR DƏSTƏ AĞ GÜL

*Sınma tənqid ediləndə gözəlim, olma məlul*
*Eybini kimsə yazarsa sən onu eylə qəbul*
*Həqqi inkar eləyib doğrudan etsən də nikul*
*Vaxt olar dövri-həqiqət edər aləmdə hülul*
*Qalar ancaq sənin adın bu cahan icrə fizul*
*Başını sal aşağa eşqu həvəsdən yaz, oğul.*

*Sanma kim heç yox imiş Qafqazara şairimiz*
*Var idi Vaqifimiz, Salikimiz, Zakirimiz...*
*Asimiz, Bixudumuz, Seyyidimiz, Sabirimiz...*
*İmdi var Səhhətimiz, Şaiqimiz, Nazirimiz...*





Müsəlmanların mənəm-mənəm artisti



Mən komediya oynaya bilmərəm mən tragikəm…




-Kabla Fətulla, gedək bir mazı dığırladaq. -Yox arvadım can üstədir, gərək bu saat həkim aparım.
-A kişi gəl!.. Bu gün olmasın on beş gün sonra olsun…nə tələsirsən?

*Balam deyəsən bu avropalı libasında olan da müsəlmandır, lap baxışı müsəlman baxışına oxşayır.*

حانا کسلندن صوڭرا

**Hana kəsiləndən sonra**

خانم مشتلقمی وير اوغلك
اولاجاق

**Xanım, muştuluğumu ver, oğlun olacaq**

Özünə çox da güvənmə bu qədər olma fizul
Başını sal aşağa eşqü həvəsdən yaz, oğul.

Qanmıram sözlərinin bircəsini sən öləsən
Hərəni qoymaram ancaq qatasan bu dölə sən
Qorxma şuxluq edirəm mən yazıram ki, güləsən
Fikir qılma ki, yəhudi dilidir ya ki moğul
Başını sal aşağa eşqü həvəsdən yaz, oğul.

Məncə get tərbiyə et sən Anadol türklərini
Bacarırsan əvəz et yağlıpasaq kürklərini
Genbalaq şalvarını qıllı kifir börklərini
Get yama kürklərini, börklərini, mürklərini
Böylə bir xidmətə türklər səni etməzsə qəbul
Başını sal aşağı eşqü həvəsdən yaz, oğul.

Olma lakin bu qədər Sanihəyə sən mail
Neçə yüz maili bu sanihə etmiş sail
Qorxuram kim edə Xalid səni axır zail
Yazasan eşqü həvəstək bizə çox latail
Sınsa qəlbin bu sözümdən ürəyin olsa məlul
Başını sal aşağa eşqü həvəsdən yaz, oğul.

*Xortdanbəy*

## TELEQRAF XƏBƏRLƏRİ

İstanbul - Buranın əhalisi neçə gündür böyük tədarük görürlər ki, Şkodra komandanı Əsəd paşanı hökumətə sadiq qaldığından dolayı təntənəli surətdə pişvaz etsinlər. Camaatın içində şimdidən bir para numayişlər görsənir. Camaat Arnaud qövminin ümumən və paşayi-mumiileyhin xüsusən Osmanlı tac təxtinə göstərdikləri xidmətlərini və sədaqətlərini böyük gurultularla alqışlayırlar.

London - Lords er Eduard Qrey hüzurunda Balkan davasının sülhü əqd olundu. Röyter ajansının verdiyi xəbərə görə Balkan dövlətlərinin tərəfindən zəbt olunan şəhərlərdə və ümum Arnaudluqda Osmanlı dövlətinə böyük bir ixtiyarat verilibdir. Məsələn, əgər qəzadır Ərdəbildən, Marağadan, Naxçıvandan, Gəncədən bir nəfər mərsiyaxanın güzarı o məmləkətlərə düşüb oranın məscidlərinin birində minbərə çıxıb camaatı feyziyab etmək istəsə mərsiyədən sonra ixtiyarı var ki, sultan həzrətlərinin ömri-dövlətinə dua oxuyub amin dedirtsin.

## FELYETON

### MARALLARIM

*(Tənqid)*

*(15-ci nömrədən mabəd)*

– Xudafiz, Mirzə Mahmud, təveqqe edirəm çalışıb düzəldəsən, çox lazımdır, yoxsa istəməz idim , xudafiz. O ki qaldı operetta, nə yazarsan özün bilərsən.

Zəncəbiliski getdi. Mirzə Mahmud bir şükür etdi ki, sabah şənbədir qəzet cıxmayacaq, tənqidi bir növ dəyişdirmək mümkün, Zəncəbiliskinin də sözlərinə gülüb dedi: Sən öləsən, bir ildə məndən sən pul istəməyəcəksən, hər mənə işin düşəndə bu borc məsələsini salırsan ortalığa.

Bir yandan nahar və üç manat nəqd, bir yandan döyülmək qorxusu, bir yandan əlli manat borcun istənilməsi Mirzə Mahmudu vadar etdi ki, tənqidi dəyişsin. Mirzə sübh tezdən idarəyə gəlib mürəttibdən xəbər alıb bildi ki, hələ tənqid düzülməyib, köhnə yazdığını alıb təzə bir ayrı vərəq kağız verib dedi.

– Bunu düz!

Yekşənbə günü "İftira" qəzetində operetta barəsində belə bir tənqid cap olunmuşdu.

## TEATR VƏ MUSİQİ
### GÖBƏYİN AĞ DƏLƏMƏ

Keçən cümə axşamı  bir gözəl tamaşaya nail olduq. Həmin gecə "Sail" cəmiyyətinin opera artistləri tərəfindən bizim musiqinəvisi-millimiz cənab Cibgirbəy Xərguşovun təzə "Göbəyin ağdələmə" adınlı operettası əsreyi-tamaşaya qoyulmuşdu. Operettanın məzmununu yazmaqdan ictinab edib,  hər bir görməyənə bu gözəl operettanı hökmən gedib görməyi məsləhət bilirik və bu səbəbdən də operettanın məzmununu yazmırıq ki, tamaşanın ləzzəti bütün olsun. Bunu deyə bilərik ki, operettaya tamaşa etdikcə milli

Tehran – Bu gecə aləmi-röyada Sultan Əhməd şaha bir nurani şəxs (bu həman nurani şəxsdir ki, 45 il bundan qabaq həman bu şahın babası Nəsrəddin şaha dəxi Kablaya getməyə əmr etmişdi) zahir olub əmr edibdir ki, gərək tezlik ilə Seyid Həmzə ziyarətinə gedəsən. Şahi-novcah sərasimə yuxudan ayılıb üməra və vüzəranı hüzuruna istəyib Seyid Həmzənin hansı məmləkətdə olduğunu onlardan sual etdi, onlar cox calışıb, əlləşib bu yan- o yan axırda "Təfsili-məqabir" kitabını tapıb ona diqqəti-təmamilə mütailə edəndən sonra məlum oldu ki, Seyid Həmzə məqbərəsi Azərbaycan dövlətinin paytaxtı Təbriz şəhərindədir. Ona görə kabinə qərar qoydu ki, şah ücün bir xaricə təzkirəsi – zaqraniçni pasport tədarük görüb şahı yola salsınlar.

Təbriz – Əlahəzrət Səməd xan tərəfindən Tehran səfiri-kəbiri olan hacı Nazimül-Əşrəfin öz dövləti - mətbuəsinə verdiyi teleqrafi xəbərinə görə buranın siyasi dayirələri Tehran şahının Seyid Həmzə ziyarətinə gəlməyinin barəsində təcili və gizli şura müqərrər buyurublar. Nəticədə bu səfərin bəzi siyasi məsələlərə dəxi əlaqədar olub iki qonşu dövlətin münasibatın pozğunlaşmasına bais olduğunu nəzərə alıb Əhməd şahın Azərbaycan məmləkətinə gəlməyini qəti surətdə rədd etdilər.



teatırımızın, milli musiqimizin tərəqqisini gün kimi aydın görüb ürəkdən şad olurduq. Yaşasın milli opera, yaşasın milli musiqinəvisimiz cənab Xərguşov. Operettanı daha da gözəlləndirən artistlərin kəmali - həvəsilə oynamaqları idi. Çamaat o qədər operettadan məmnun qaldı ki, əgər həman gecə artistlər təzədən başlayıb həman operettanı oynayaydılar, yəqin hamı əyləşib, təzə məsruriyyət ilə operettaya dubarə qülaq asardılar. Söz yox ki, artistlərdən camaatın diqqətini cəlb edən müsəlman səhnəsinin fəxri cənab Qudurğanov idi. Bu cənabın hər bir hərəkatı camaat tərəfindən alqışlanırdı. Xüsusən ki, üzünü məşuqəsinə tutub bu qəzəli oxudu:

*Göbəyin ağ dələmə*
*Görmüşəm düymələmə*
*Di qoy, di qoy, di qoy*
*Məni yar öldürsün*
*Gözləri xumar öldürsün*
*İxtiyarı var öldürsün.*

Teatroya bir gurultu düşdü kü, "Xudanəkərədə, divarlar bu saat ucacaqdır". Camaatdan baqqal Kərim, çaqqal Rəhim, saqqal Səlim o qədər əl vurdular ki, axırda üçü də yıxılıb ürəkləri getdi. Operettalar görmüşük və məşhur artistkalara qulaq asmışıq, amma bunu ürəkdən deyə bilərik ki, övrət rolunu ifa edən Zəncəbilinski cənablarının səsitək səsi nə rus, nə müsəlman səhnəsində eşitməmişik.

Bu artistin nə oxumağı oynamağından və nə oynamağı oxumağından qalmazdı. Aya Qudurğanovsuz və Zəncəbilinskisiz teatra getməkdə bir ləzzət var, ya yox? Həqiqət bu iki vücud müsəlman teatrının zinətləridirlər. Qalan artistlər hamısı bəqədri-məqdur öz rollarını keçirtdilər. Xor həmçinin layiqi-təhsin idi. Tənqidi tamam edib "Sail" cəmiyyətindən bu növ gözəl operettaların tez-tez səhnəyə qoyulmasını gözləyirik və Xərguşov cənablarından da bundan da gözəl təsnifat yazıb səhnəmizi müzəyyən etməsini ümid edirik.

*Ceyranəli*

*Müdir və baş mühərrirlər:*
*Cəlil Məmmədquluzadə, Əliqulu Nəcəfov*






*Nə qədər olsa İranda məşrutəxah - Tapam birbəbir təşnəkam öldürəm.*

19 rəcəb 1331 **Səkkizinci il** 11 июня 1913 г.

# ملا نصر الدین

**№17 Qiymәti 12 qәpik.** МОЛЛА НАСРЕДДИНЪ **Цена 12 k. № 17**

*Osmanlıda partiya müharibəsi*




*Hər tərəf koştə şəvəd məsləhəti-islaməst*

**Adres:** *Tiflis, Davidov küçəsi nömrə 24.*
**Адресь:** *Тифлись, Давидовская, 24.*
**Teleqram üçün:** *Tiflis, "Molla Nəsrəddin".*
**Для телеграмм:** *Тифлись, "Молла Насреддинь".*
***Подписная цена:***
***На годь - 6 руб.***
***6 месяц - 3 р. 50 к.***
***3 месяц - 2 р.***
***1 месяц - 40 к.***
Adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

**Qafqazda və Rusiyada**
**12 aylığı - 6 manat**

"------------------------" 6 aylığı - 3 manat yarım
"------------------------" 3 aylığı - 2 manat
"------------------------" 1 aylığı - 40 qəpik
*Əcnəbi məmləkətlərdə 12 aylığı - 7 manat*
"------------------------" 6 aylığı - 4 manat

***Tək nüxsəsi idarəmizdə 10 qəpik, özgə şəhərlərdə 12 qəpik.***

## İDARƏDƏN

Möhtərəm müştərilərimizə lazım bilirik elan edək ki, hər kəsin abunəsinin vaxtı qurtarıbsa gərək pul göndərsin, əksi surətdə onun jurnalını dayandıracayıq və habelə o şəxslərdən ki, məcmuəmiz onlara nisyə göndərilir, xahiş edirik ki, pulların tezliklə idarəyə yetirsinlər və bir də o ağalara ki, bildir, inişil idarə tərəfindən vəkil olub jurnal satıb idarəyə indiyədək borclu qalıbdılar, təvəqqe olunur ki, hesabımızı tamam kamal göndərib bizi başqa bir vəsilələrə müraciət etməyə vadar etməsinlər.

## TƏZƏ ÇAPDAN ÇIXDI

Hüseyn Cavidin "Ana" adlı əsəri 20 qəpik və "Keçmiş günlər" 12 q. və Məhəmmədzadənin "Arvad məişəti" 15 q. tək-tək istəyənlərdən marka da qəbul olunur. 10-dan ziyada alanlara yüzdə iyirmi beş skitka edilir.

Адресь: Тифлис, книжн.торг. Мамед-заде.

## KABLAYILAR

Mən çox adamlar görmüşəm ki, neçə il həsrət çəkib hər il çavuş carlıyanda ki, hər on ki azimi-kərbbəlast xoş başəd, gözünün yaşını übərati-qətərat Tiflisin may ayının yağışları kimi töküb qəm-qüssə dəryasına cumandan sonra axırda tab gətirməyib var-yoxun töküb bazara dəyər-dəyməzinə satıb üz qoyubdu ziyarətə getməyə və qayıdıb gələndən sonra hər hansından da soruşmuşam ki, sizin bu vacibi səfəriniz neçə ay çəkdi və nə qədər yol getdiniz və buradan ora neçə mənzildir? Və o düz, salamət və rahat əmniyyət yolların və abad, təmiz, pakizə şəhərlərin bir-birlərindən fasiləsi nə qədərdir?

Cavab veriblər ki, Şücadan beş yatdıq yetişdik Mərəndə, oradan on bir yatdıq çatdıq Binaba və oradan iyirmi iki yatdıq yetişdik Təkantəpəyə və oradan Süleymaniyyə yolu doqquz yatdıq yetişdik Qəsri-Şirinə və oradan on yeddi yatdıq getdik Xanaqıya və oradan on beş yatdıq çatdıq Sərməırraya, oradan on üç yatdıq çatdıq Kazimeyn əleyhüssələvat vəssəlamə. Mən bu sözləri eşidəndə əvvəla, çox-çox təəccüb edirdim və deyirdim ki, pərvərdigara bunlar ki belə yuxulu-yuxulu Kablaya gedib qayıdıb gəlirlər və o yollar da doludur ənizə ərəblər ilə ki, hamısı yolkəsən, quldur və oğru adam öldürəndirlər, nə təhər olur ki, bunlara yaxın düşə bilmirlər? Və onlardan əlavə nə cürə olur ki, Yəkan, Kukəmər seyidləri və ziyarətgahların dilənçiləri və xədəmələri və mücavirləri bunları soyub soymalayıb lat-lüt eləmirlər və bunlar genə tələsik qayıdırlar vətənlərinə?!

Sonra düşündüm ki, bunlar nəinki bir Məkkəyə, Kərbəlaya, Məşhədə yuxulu-yuxulu, yata-yata gedirlər-gəlirlər bəlkə öz vətənlərində də bunların ömrü yuxu aləmində keçir və heç özlərindən xəbərləri olmur. Ancaq söz buradadır ki, bunların yaxşı mötəbər və istəkli dostları və rəfiqləri var ki, həmişə gözləri onların üstündədir və hər dəqiqə bu yatmışlara onlar pasiban olur və qaravul çəkirlər və gözətliyirlər ki, bunlara düşmən yavuq düşməsin və heç bir tərəfdən canlarına, mallarına afət yetişməsin.



Və həmin bu istəkli və mehriban dostlar da "Novoye vremya", "Russkoye slovo", "Bakı", "Listok" və qeyri qəzetlərin heyəti-təhriyyələridir ki, gecə-gündüz bunların qədəmlərini ölçüb xeyir-şərlərini mülahizə edirlər və bir dəqiqə qafil deyillər və məhəbbətin çoxluğundan milçək kiçikliyində olan bitli, sirkəli hacılar, kablayılar onlara fil böyüklüyündə görsənir və hər bir dəlikdə, deşikdə onları görürlər.



Hətta "Novoye vremya" idarəsi bunlardan nigaran olur ki, məbada Məkkədə beytüllahi-həramın içində mənasiki-həccə məşğul olurlar, onlara bir bəla yetişə və ya bir qafil sədəmə toxuna və yainki rəmi-cəmrə edəndə bəzi xırda daşlar atanda birisi səhvən bunların bir-birinə dəyə və inciyələr, məxsusən adam göndərir ki, orada dəxi onlardan müğəyyət olsun və çünki gecə-gündüz fikri, zikri onlara məşğuldur, hərdənbir gecələr hövlnak yuxular görüb bədxab olurlar.



Məsələn, bəzi vaxt aləmi-röyada xörəyin buxaratındanmı, məhəbbətindənmi, mədənin qüvvətindənmi, nədənmi? Bunun yuxusuna şeytan şəklində bəzi fəsilillər gəlirlər ki, dəstə-dəstə əllərində baydaq və üstündə Əlmöminunə üxüvvətün yazıları üz qoyublar onun rəfinə və istəyirlər onun gözünün işıqlarını əlindən alsınlar, odur ki, fövri sərasimə olub yuxudan ayılıb divanə kimi çığırır ki: haray!... Dada!... Qoymayın!... Axtarın!.. Tapın!... Tutun!... Öldüm... Cırıldım... Dağıldım... Partdadım... Aman... aman qoymayın!..Pan... pan... pan!... Bağrım oldu qan!... qan!.. qan!... tufan.... Tufan... müsürman... müsürman... müsürman...



Bunun bu haray hurayına dəxi istirahət ilə uyumuş o rəfiqləri, bir gərnəşib bir iyildəyib gözlərini yuxulu, yuxulu ovub bu qışqırığa, bu hay-küyə bir gülümsünüb:

*Bizə bax nə gündəyik*
*Yara bax nə sallanır?!!!*

Deyib hellənib genə yatışırlar.

*Yazdı Sarsaqqulubəy, təsdiq etdi Cüvəllağıbəy*



### ƏDƏBİYYAT

Yavaş, toxta, şitab etmə, dayan, türk!
Otur, əyləş, bir az dincəl, uzan, türk!

Ol asudə uzan, et istirahət
Gecə-gündüz çalışma qıl fəraqət
Vücudunda nümayandır nəqahət
Olur halın günə-gündən yaman, türk!
Otur, əyləş, bir az dincəl, uzan, türk!




İntelligent müsəlman evində qonaqlıq.
Evin xanımı
ايوك خانمى
РОТТЕРЪ.




اوشاخلاره تحفه

Uşaqlara tövhə

روس

Rus

مسلمان

Müsəlman

Oğlum, götür bu noxud-kişmişi doldur cibinə, ye ağzın şirin olsun.

Oğlum, al bu kitabı oxu, öyrən elmin olsun.

Saralmışdır gülə bənzər camalın
Olub qorxunc çox didari-halın
Sınıb qəlbin, qırlmış pərrü balın
Dəxi ömr etməyə yoxdur güman, türk
Otur, əyləş, bir az dincəl, uzan, türk!

Sənin cisminlə saziş etmədi dəhr
Olur qəndi cahanın canına zəhr
Əlindən getdi dövlət, məmləkət şəhr
Bari qalmadı sağlam yalxı can, türk
Otur əyləş, bir az dincəl, uzan, türk.

Cahanı qıldı istila nəjadın
Uzun vaxt etdi cövlan şanlı adın
Fəqət yoxdu bilik, fikr, ittihadın
Əlindən çıxdı yeksər nagəhan, türk
Otur, indi bir az dincəl, uzan, türk!

Çürük osmanlılıq fikri, xəyali
Çürütdü türklüyü yurd qaldı xali
Dağıtdı, əzdi, türkü Babi-ali
Qazandı özgələr, etdi ziyan türk
Otur, indi bir az dincəl, uzan, türk!

O dəm ki, ölkədə hürriyyət oldu
İdarə döndü məşrutiyyət oldu
Niyazi, Ənvər oldu Şövkət oldu
Verən bu mürdəganə tazə can, türk
Həp alqışladı onları cahan, türk!

Hanı indi böyük adlı Niyazi?!
O türkün, türk elinin sərfərazi?
Yetirməz bir də Rəsnə bir Niyazi
Niyə oldu şəhid ol qəhrəman, türk?
Oyan, bəsdir, oyan, bəsdir, oyan türk?

Niyazinin dalınca getdi Şövkət
Sevinsin şad olsun köhnə ümmət
Gedər bunlar, qalar əhli-şəriət
Qoy olsun bağrı qan cümlə cavan türk,
Otur indi bir az dincəl, uzan türk.

Canım, bu iş tutardı baş nasıl?
Müsəlmanlar edərmidi təğafil?
Qalaydı sədrdə Şövkət... bə Kamil?
Olaydı sədri-sabiq sütsatan türk?
Ona hökm eyliyəydi hər zaman türk?

İyitlik varmadı vəqta ki, başa
Atın yalına yat, düşmə təlaşa
Əbəs bel bağlama hər arqadaşa
Olarlar arnaudlartək yaman, türk,
Tökər bir çox ağır qiymətli qan, türk
Otur, əyləş, bir az dincəl, uzan, türk?

*Keyfsiz*

## BİZƏ YAZIRLAR

*İrəvan quberniyasındakı*
*baş Noraşindən*

Neçə vaxt bundan qabaq vəfat etmiş bir rus qulluqçusunun arvadı öz sevdiyi əlli yaşında bir boynuyoğuna özü gedə bilmədiyindən on bir yaşında qızını ki Tiflisdə pansiyonda oxuyurmuş çığırda-çığırda pansiondan çıxardıb aparıb həmin kişiyə ərə veribdir.

***Molla Nəsrəddin:***

Bu mətləbi yazan hərçənd ki bunu bir qəribə əhvalat bilib yazıbdır. Ancaq biz bu cürə şeylərə heç vaxt təəccüb etmirik. Biz çox görmüşük və eşitmişik ki, filan arvad öz qızını boşatdırıb özü onun yerinə ərə gedibdir. Və yainki filan kişi öz gözünün ağı, qarası olan bir qızını nəzir deyib veribdir bir julik, qumarbaz, tiryaki, ac və çılpaq seyidə. Məsələn, Qarabağ mahallarında ordubadlı Ağ seyidin uşaqlarına yüzlərlə körpə qızları nəzir deyib verirlər və naxçıvanlı mərsiyəxan Ağa Mir Pırtdaşıq hər il Qarabağlar kəndinə mərsiyə oxumağa gedəndə hər dəfə nə qədər pul verirlərsə üstündə bir iki qız da nəzir deyib verirlər ki, özünə şər'i hərəm eləsin. Deməк burada günah heç kəsdə deyil. Kim kimə qismətdirsə ona çatacaq və labüddür hər qızın alnına nə yazılıbsa o olacaqdır. Və ondan əlavə hər müsəlman qardaş da gərək çalışsın axırətinə tuşə qazanmağa. Bundan artıq bir feyz və savab ola bilər ki, peyğəmbər övladına qız verib onunla qohum olasan və qiyamətdə vasitə olub səni behiştə aparsın?!!



Şuşa qalasından: bu gecə bir böyük ehsan məclisində ki bütün şəhərin əyan-əşrafı və üləması cəm idi, rəqayib barəsində bəhs düşdü, çox tulani danışıqdan sonra lap böyük molladan bu barədə sual etdilər ki, rəqayib kimdən və nə vaxtdan qalıbdır?

Cənab axund saqqalına seyqəl verib bir-iki dəqiqə sükutdan sonra fərmayiş etdi ki: zamaniki bizim peyğəmbərimiz düşdü anası Aminə xatunun

bətni-şərəfinə xudavəndi-təbarəki-təaladən hökm yetişdi ki, ey Cəbrail durma get yer üzündə olan cəmi məxluqata əmr elə ki, halva çalsınlar, aşlar, sarı şilələr və hər cür şirnilər pişirib paylasınlar qarnıtox və boynuyoğun bəndələrə, bədürüsti ki, biz onlardan ötrü peyğəmbər göndərəcəyik ki, onları behiştə aparsın.

## SAXSIQƏLƏM:

Biz o ağalara təəccüb edirik ki, rəqayib kimi vacib və şər'i əməlləri indiyədək dürüst anlamayıb indi üləma həzəratından sual edirlər və bu cür məsələlərdə qəlblərin qəsavət basıb mütərəddid qalırlar, vəhalonki həzərat, üləma hər il bu rəcəb, şəban aylarında yüz dəfə minbərələrdə rəqayib barəsində izahat verib camaatı təşviq, tərqib edirlər ki, bu feyzdən məhrum qalmasınlar və hər kəsin iqtidarı rəqayib eləməyə olmasa da savabından ötrü paltar-palazı satıb ya borc eləyib bu müstəhəb əməli yerinə yetirsin.

Söz yox ki, bəzi əşxasə şeytan vəsvəsə edər ki, qəlblərinə bu cür dəğdəğələr gəlir.



## POÇTA QUTUSU

Rəhmanə kəndində "Süfrə milçəyi"nə: yazırsan ki, bu gün mərsiyəxanımız ilə vaizimizin bir mötəbər hədisin üstündə böyük mübahisələri düşdü və camaat dəxi ikitirə olub az qaldı qan qurşağa çıxsın və deyirsən guya o hədisi-şərifi mərsiyəxanımız Fazil Dərbəndi əleyhüssəlamdan rəvayət edirmiş ki, vaiziniz deyib kəs səsini belə latailatı əimməyi-əthar haqqında söyləmə! Həqiqətdə biz bu mətləbə çox təəccüb etdik. Çünkü əgər, hərgah bir hədis başqa bir alimdən rəvayət oluna genə demək olar bəlkə əhyana səhih olmamağına cüzi ehtimal getsin, amma Fazil Dərbəndinin yazdıqlarının heç bir yalanı ola bilməz. Çünkü o sözlərin çoxusunu o kişiyə yuxuda mələikələr deyiblər.

Dərbənddə "Arada gəzən"ə - Hacı Məhəmməd Hüseyn Hüseynovdan razıçılıq edirsən ki, şəhər banqasında fəqir-füqəraya çox köməklik elədiyindən hərçənd ki, camaat şərarət edib oradan kənar etmişdilər, indi şükür olsun Allaha gətirib təzə güşad olan banki-istiqraziyyə üzu ediblər.

Biz dəxi şad olduq, vaqeən bəzi hökumət dairələrində və bank idarələrində o cür şəxslərin vücudu çox-çox qənimətdir. Naxçıvanda da bəzi məşədilər var ki, insaf üçün bank işində camaatın boynuna böyük haqlar qoyurlar. Allah Hacı Mirzə Həsən ağa müctəhidin zöhdü təqvasinin və insaf-mürvətinin xatirinə bu cür ağaların vücudlarını bibəla eləsin.

İrəvanda "Yalançı"ya - Yazırsan Hacı Ərus adlı bir mömin və müqəddəs kişi labüd naçar qalan əkinçilərə, çovdarlara zalik ilə yüz manat verib ayda iyirmi manat icarə alır. Demək, yüz manatın ildə üç yüz manat icarəsi olur.

Biz hacını çox yaxşı tanıyırıq ki, necə dindar adamdır və necə namazqılan, oruc tutan Allah bəndəsidir və ömründə bir dəfə murdar urus, erməni əlindən su alıb içməyibdir. Gəl Allaha bax o kişiyə iftira demə, istiğfar elə, sənin günahının odu bizi də yandırar.



*Müdir və baş mühərrirlər:*
*Cəlil Məmmədquluzadə, Əliqulu Nəcəfov*



Tiflisdə gürcü şirkət mətbəəsində çap olundu.
*Электроп. Грузинск. Изд. Товарищества Больш. Ванская ул. 12*



*Görəsən bunlarda da siğə eləmək var? Yoxsa elə bizim şəriətimiz genişlikdir?*

# ملا نصرالدين

**№18 Qiyməti 12 qəpik.** МОЛЛА НАСРЕДДИНЪ **Цена 12 k. № 18**


*Gavist dər asiman naməş Pərvin* *Yek gave digər nəhoftə dər zire-zəmin*

**Ziro zəbəre do gav moşti xər bin** **Çeşme xirədət baz kon ey əhle yəqin**

*Ömər Xəyyam*




*Yəni bir öküz ki, onun adı Pərvindir göydə durub, ikinci öküz də gizlənib yer altında, bunların arası doludur Allahın heyvanları ilə.*

**Adres:** *Tiflis, Davidov küçəsi nömrə 24.*
**Адресь:** *Тифлись, Давидовская, 24.*
**Teleqram üçün:** *Tiflis, "Molla Nəsrəddin".*
**Для телеграмм:** *Тифлись, "Молла Насреддинь".*
***Подписная цена:***
***На годь - 6 руб.***
***6 месяц - 3 р. 50 к.***
***3 месяц - 2 р.***
***1 месяц - 40 к.***
Adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

**Qafqazda və Rusiyada**
**12 aylığı - 6 manat**

"-----------------------" 6 aylığı - 3 manat yarım
"-----------------------" 3 aylığı - 2 manat
"-----------------------" 1 aylığı - 40 qəpik
*Əcnəbi məmləkətlərdə 12 aylığı - 7 manat*
"-----------------------" 6 aylığı - 4 manat

***Tək nüxsəsi idarəmizdə 10 qəpik, özgə şəhərlərdə 12 qəpik.***

## İDARƏDƏN

Möhtərəm müştərilərimizə lazım bilirik elan edək ki, hər kəsin abunəsinin vaxtı qurtarıbsa gərək pul göndərsin, əksi surətdə onun jurnalını dayandıracayıq və habelə o şəxslərdən ki, məcmuəmiz onlara nisyə göndərilir, xahiş edirik ki, pulların tezliklə idarəyə yetirsinlər və bir də o ağalara ki, bildir, inişil idarə tərəfindən vəkil olub jurnal satıb idarəyə indiyədək borclu qalıbdılar, təvəqqe olunur ki, hesabımızı tamam-kamal göndərib bizi başqa bir vəsilələrə müraciət etməyə vadar etməsinlər.



## BAŞ

Elm sahibləri, fənn sahibləri bir dəqiqə bikar deyillər, gecə və gündüz çalışmaqdadırlar ki, təzə bir elm, təzə bir fənn kəşf eləsinlər.

Elm və fənn sahiblərinin bu növ çalışmaqları, əlbəttə nəticəsiz qalmır və qala da bilməz və görürük ki, hər il təzə bir iş, ağıla sığışmayan bir xəbər, ağıl kəsməyən bir əməl qulağımıza çatır. Ya həkimlik işlərindən, ya mexanika və elektrik dairələrindən, yainki xud kimya və təbiət aləmindən.

***

Rahatlıq bilməyib çalışan alimlərin vücudları biz sadə bəndələr üçün çox bahadır, ondan ötrü ki, o ali cənabların növ-növ ixtiraatının bərəkətindəndir ki, biz vaporun, teleqrafın, təbabətin nemətlərindən nəfbərdar oluruq.

*Rus, alman, firənglər həmə dər karənd*
*Ta to nani bekəf ari və berahət bexori*
*Həmə əz bəhri to sərgəştəvü fərmanbərdar*
*Qul edib onları tarı sənə səndən ötrü.*

***

Möhtərəm oxucularımıza ərz olsun ki, tibb aləmindən axır vaxtlarda danışılan məsələ anabiyoz məsələsidir ki, rus professorlarından məşhur Baxmetyev cənabları tərəfindən icad olunubdur. Cənab Baxmetyevin ixtirasının əsli budur ki, cəmi heyvanat bir dərəcə donmaq halına çatanda yarıdiri olurlar, yarıölü olurlar. Yəni nə diri demək olur, nə ölü, nə canlı kimi hiss edirlər, nə ölü kimi hissiz olurlar.

Professor cənablarının fənni imtahanları elə bir qəribə nəticə bağışlayıb ki, bu xüsusda tamam Avropaya şöhrət salıb, hətta Amerika ruznamələri gün olmur ki, bu barədə yazmasınlar.

Təqribən bir ay bundan qabaq Parisdə həkimlər məclisində Baxmetyev cənablarının nitqi biz müsəlmanlar üçün xeyli əhəmiyyətlidir. Çünki həman nitqdə bəyan olunan mətləblərin biri budur ki, dünyada yaşayan başları qırxıq millətlər həmişə anabiyoz halında yaşayırlar. Səbəb budur ki, qışda şiddətli soyuğun təsirindən qırxılmış başlar anabiyoz olurlar, yəni donub nə ölü olurlar nə diri.

***Mordəənd vəli zində***

Hərçənd həman məclisdə cənab professora irad edən olub, lakin bu məsələ genə şayani-əhəmiyyətdir. Məsələn islam aləmindən xəbərdar olan məşhur fransız səyyahı müsyö Lejortaj cavab verib ki, qışın şiddətli soyuğu müsəlman başlarını anabiyoz halına sala bilməz. Zira ki, müsəlmanlar gecə-gündüzün iyirmi dörd saatın səkkiz saatını isti hamamda keçirirlər ki, həna və rəng yaxşı tutsun.

Qəzetlər yazır ki, müsyö Lejortajın cavabı təsirsiz qalmayıb. Çünki firəngcə oxuduğu nitqi Sədinin şerlərilə tamama yetirib:

*Bələğəl-ulə bihaməmihi*
*Kəşəfəd-dunyə bihicamihi*
*Həsənət cəmiu xasalihi*
*Sallə aleyhi va alihi*

*Molla Nəsrəddin*

## ƏDƏBİYYAT

*Naxçıvanda bir bağça yaxud skverdən bir yarpaq*

Yatıb yubanma ay könül - Oyan, göz aç zamanı gör
Olub bahar, açıbdı gül - Bu fəsli-dilgüşanı gör
Keçirmə qəflətilə gün - Gəzib baxıb cahanı gör
Dolan müsəlman aləmin - Hər ev, hər aşiyanı gör
Xüsusən etgilən səfər - O şəhri-Naxçıvanı gör
Orada iskver bağın - O gül o gülüstanı gör

O bağın et siyahətin - Nələr var ol məkanda bax
Bir öylə bağ olar çətin - Xətaydə, Yaponda bax
Nigah qıl da qüdrətin - Təbiətin bir onda bax
Hanı o şəhrtək məkan - Zəminü asimanda bax
Nə çoxdu bəy, qəni və xan - Biladi- Naxçıvanda bax
O iskver nişinləri - O xəlqi-kamranı gör

***

Orada əyləşənlərin … - Edib də seyr halını
Eşit o söyləşənlərin - Qulaq verib məqalını
Bəyəm deyə şişənlərin - Düşün o yanda qalını
Və səcdəyə düşənlərin - O hali-pürməlalını
Bu yanda əsnəşənlərin - Cəmalını, kəmalını…
O kiçik iskverdə bax - Cəhimi gör, cinanı gör

Gəzib dolansan aləmi - Açıq göz ilə sərbəsər
Behişt ilə cəhənnəmi… - Səravü mavəranı gər
Tapılmaz işbu yer kimi - Məkan, müqərr, bum bərr
Burada görməsən, qəmi - Bura behiştdir məgər?
Behişt əhlidir, hamı - İgid, qoçu, şəci nər
Fərib, şərr qiybətin… - Axundu gör yalanı gör

Birisi qiybət eyləməz - Oruc, namaz əhlidir
Bunun ona sözün deməz - Ümumi raz əhlidir
Həram bir tikə yeməz - Bular niyaz əhlidir
Gözəl yaşayış istəməz - Kötək, qapaz əhlidir
Nəsihət, əcz dinləməz - O, kibrü naz əhlidir
O kibrü nazə qıl nəzər - Bu çeşmi-xunfəşanı gör.

O bağa düşsə gər yolun - Elə muhafizət özün
Bax, onlara sataşmasın - Hayıfdılar, dəyər gözün
Elə dolan ki düşməsin - Bəyə, xana tərəf üzün
Görünsə surətin gözə - Düşər ağızlara sözün
Olur dalınca söz füzun - Dedi-qodu, uzun, düzün
O da o gunə şerdir - Bəqanı gör, fənanı gör.

Olar yəhud, rustək - Gecə-günüz çalışmayır
Nə hindi, nə məcustək - Maarifə alışmayır…




*Mən ki bunların birisini çağırdım, bu zalımlar deyəsən hamısı kablayı imişlər, hamısı dönüb baxdı?!*



*Bu komediyanı yazmışam, indi peşiman olub qalmışam mat-məəttəl bilmirəm bunu kim oynıyacaq. Çünki artistlərimiz hamısı tragikdirlər!..*




*Qriqori İvanoviç! Görəsən bunların bu toqqası, zənciri, bu cür arxalılığı, börkü olmasa bunların səsi çıxmaz?*

*Bikardılar xoruztək – İşə-gücə qarışmayır*
*Qoçaqdı zorlu tustək – savaşmadan qamaşmayır*
*Çıxır sədası kustək – Nəzakətə yanaşmayır*
*O sövti-dilxəraşə bax – O vəhşiyi-yabanı gör.*
*O surətə, o başa bax – Bu huri-mehliqanı gör*

*Bu düxtəri-ülumə bax – O yari-aşinanı gör*
*Bu millətə, bu qövmə bax – O şövkəti, o şanı gör*
*Həyata meyli yox burax – Üzündə yox nişanı gör*

*Donub bədəndə qanı gör*
*Rəməqdi, yox rəvanı gör*
*Açıldı bax dəhanı gör*
*Çıxar bu ləhzə canı gör*

*Ucalt fəqanını, könül*
*Bu mərgi-bibəhan gör*
*Bu dərdi-bidəvanı gör.*

*Kefsiz*

## İDARƏDƏN

***(14-cü nömrədəki qırx hədisin mabədi)***

11) Mən səbbəhəllah ərbəinə yaumən fi külli yaumin ərbəa mərratin yəkunu ğunyən fid-dunyə, yəni hər kəs qırx günə kimi hər gün dörd yüz dəfə dizi üstə çöküb sübhanallah deyə, Allah o şəxsi milyonçu eylər. Daha neft quyusu qazdırmaq, əmələnin qanını şişəyə tutmaq və özgənin yerini yiyələnmək lazım deyil.

12) Mən təşəbbəhə biqaumin fəhum minhüm, yəni hər kəs frant geyinə, əlində tros, gözündə pensne ola və gecə damalar ilə qol-qola gəzə, yevropalıya oxşar. Daha elm, sənət öyrənmək və iş dalınca getmək, xaricə dillərindən bilmək lazım deyil.

13) Əl-muminunə fid-dunyə kəttayri filqəfəs, yəni mömin qardaş dünyada qəfəsdə olan quşa bənzər ki, həmişə çalışır qəfəsdən qurtarıb uçub elə bir yerə düşsün ki, onu heç tanıyan olmasın, orada naməhrəmləri başına yığıb pak-pakizə arağı, çaxırı vurub keyf çəkməyə məşğul olsun.

14) Məni-stəxəffə alimən kəməni-stəxəffəl-lahə va məni-stəxəffəl-laha yəkunə kəfiran, yəni hər kəs Naxçıvanda Seyyid Qoradənin "Molla Nəsrəddin"ə yazdığı həcviyyatına ki, hər çayçı dükanında oxuyur, istehza eyliyə və ağanı biləyinə səriyə kafir olar. Bu hədisin təhtinə Təbrizdəki cəmi əhli-dübbələr də daxildir ki, bəzi üləmanı minbərdə təhqir edirlər.

15) Əksəru əhlil-cənnəti əlbiləhə, yəni cənnət əhlinin çoxusu ağıllı, şüurlu seyidlər, təmkinli, ədəbli mollalar, həyalı, abırlı tələbələrdir ki, həmişə mədrəsələrdə və məqbərələrdə ədəb dairəsindən kənar və senzorsuz söz əbəda danışmazlar.

*(Sonrası var)*

## QAFQAZ
## ŞİVƏSİNƏ GÜLBUSƏ

*Təbim istər gəzə bir yer ki qalıb mat üqul*
*Qorxuram çak edələr bikrini axır qala dul*
*Lal edə natiqəmi Xalid olam xarü məlul*

*İştə baş, iştə beyin, iştə ədibi-məfzul*
*İştə lövh, iştə qələm, iştə kütüb, iştə fühul*
*Səbribəyzadə, həqiqətdə oğulsan, sən oğul.*

*Dili üç, beş kişi saf etməyə olmaz qadir*
*Gərək əsnafdən olsun belə məclis hazir:*
*Ədibi, incineri, doktoru, angəh şair*

*Bir də Yalı mütəfənnin və müvərrix camaşir...*
*Nöqtə qoy eyləmə tedad sözün tapmıya tul*
*Səbribəyzadə, həqiqətdə oğulsan, sən oğul.*

*Gəh biri şəkl çəkib zaviyə qılsın əfraz*
*Birisi mədədən, ixlatdan etsin ağaz*
*Hakəza hər biri bir fənnlə olsun dəmsaz*

*"Təsfiyə" eyləmək, amma camaşirsiz olmaz*
*Nə edim haqqı düşünməz ki, şu qafqazlı cühul*
*Səbribəyzadə, həqiqətdə oğulsan, sən oğul.*





*Nə qanır şivəni hər çubi-"xudayi-nabit"*
*Düz kökdür sözə yoxsa yaramaz hər şimşit*
*Tabe ol Xalid, qafqazlı qafanı bərkit*
*O kişi sözləri alt-üst eləyibdir beyt-bint*
*İştə baş, iştə qulaq, iştə ədibi-məqul*
*Səbribəyzadə, həqiqətdə oğulsan, sən oğul.*

*Xortdanbəyzadə Sərçəqulu*

## İXTAR

Bakı qəzetinin idarəsi ümum həmməsləklərinə elan edir ki, işbu iyun ayının 16-dan etibarən Balkan müttəfiqlərinin arasında vaqe olan müharibədən dolayı idarəmizdə təziyə məclisi bərpadır və hər gün səhərdən axşama kimi heyəti-təhririyyəmiz təşrif gətirən ağalara pəziralıq edir. Əza məclisimizin bir şöbəsi Peterburqda "Novoye vremya" idarəsində, birisi Moskvada "Russkoye slovo" idarəsində, biri dəxi Tiflisdə "Listok" idarəsindədir. İzhari-təsliyət edən əşxasə öz razıçılığımızı qəzet vasitəsilə bəyan edəcəyiz.

## TELEQRAF XƏBƏRLƏRİ

Van - Vanın, Bitlisin, Sasunun, Zeytunun əhalisi təzə Balkan müharibəsindən həyəcana gəlib bolqarlara, yunanlara, serblərə peydərpey teleqraf göndərib tövsiyədə bulunurlar ki, qardaş qanı tökməkdən vaz keçsinlər. Çünki balkanlıların bu hərəkətləri onların bişmiş aşlarına soyuq su qatır.

Naxçıvan - Şəhərin qazısı təzə Balkan davasından yana istəyir qəzet vasitəsilə Təbrizə Hacı Mirzə Həsən ağa müctəhidə bəyani-təsliyət eləsin, amma qalıb mat-məəttəl, bilmir hansı qəzet idarəsinə bu təziyətnaməni göndərsin ki, ondan peşiki iyirmi manat pul istəməsinlər?!

Tiflis - Bu günlərdə Şeytanbazardan keçmək qeyri-mümkündür. Ekskursiyaya gələn xanımlara və gimnazistlərə tamaşa eləməkdən qırmızısaqqalların ağızlarının suyu o qədər axıb ki, bir dərya əmələ gəlib, əhali həyəcandadır.

Bakı - Bakılılar özlərini və ətraf kəndlərini maarif suyu ilə sirab edəndən sonra qət elədilər ki, Tiflisdə idareyi-bələdiyyə tərəfindən müsəlmanlara qız məktəbindən ötrü verilən yerdə bir qız gimnaziyası tikdirsinlər.

*Müdir və baş mühərrirlər:*
*Cəlil Məmmədquluzadə, Əliqulu Nəcəfov*

## İANƏ

Maarifpərvər arqadaşımız Salman Əsgərov cənablarının vasitəsilə sevgili şairimiz mərhum Sabir Tahirzadənin çap olunmayan əsərlərinin təb olunmağına Aşqabaddan yığılan ianələrin surəti:

İran konsulu 10 manat, Camalbəy Camalbəyov 10 m., Salman Əsgərov 10m., Talıb İmanov 8m., Zülfüqar Cəfərov 5m., İskəndər Məmmədov 5 m., Hüseyn Yunusov 5 m., Ağa Əhməd Əliyev 5 m., Mirzə Əhməd Əliyev 5 m., Həbib Bağırov 5 m., Səfərəli Rüstəmov 5 m., Mürsəl Əliyev 5 m., Lampa nam müstəar ilə 5 m., Adilxan Nəsirbəyov 3 m., Mirzə Əhədxan 3 m., İbad Əliyev 3 m., Mir Mehdi 3m., Mosesov 3 m., Əsgər Məmmədov 3 m., Əşrəf Tağıyev 3 m., İskəndər Şükürov 3 m., Molla Rza Rəbiyev 2 m. 50 q., Sərkisbəyov 2 m.. Məmməd ağa Kaşanski 2 m., Əliqulu Səfərov 2 m., Ələkbər Zeynalov 2 m., Əbdüləli Həsənov 2 m., İbadbəy Tahirov 2 m., Qara Bağırov 2 m., Hacı Məmmədsadıx Həsənov 2 m., Səttar Məmmədxanov 2 m., Əhməd Ağa Hüseynov 2 m., Zeynal Mahmudov 1 m. 50q., Seyid Abas Ağamirov 1 m., Bəşir Hüseynov 1 m., Məmmədağa Həmzəyev 1 m., Hacı Əsədulla İbrahimov 1 m., Təqibay Kürdoğlu 1 m., Hacı Hüseynov 1 m.. Əhməd Məmmədov 1 m.

*Cümlətani 137 manat 55 qəpik.*

*Bu pullar idarənin vasitəsilə Mehdibəy Hacınskiyə tapşırılıbdır ki, mərhumun əsərlərinin çapına məsruf etsin.*



*Электр.п. Гурзинск. Изд. Товарищества Больш. Ванская ул.№21*




*Millətim və özüm ac ola-ola, cəmi gümanım bu əlimdəkinə gəlir,*
*onu da mən "hamiyi-islama" (bərgi-səbz) təqdim edirəm.*

20 şəban 1331 Səkkizinci il 12 июля 1913 г.

# ملا نصرالدين

№19 Qiymәti 12 qәpik. МОЛЛА НАСРЕДДИНЪ Цена 12 k. № 19



Adres: *Tiflis, Davidov küçəsi nömrə 24.*
Адресь: *Тифлись, Давидовская, 24.*
Teleqram üçün: *Tiflis, "Molla Nəsrəddin".*
Для телеграмм: *Тифлись, "Молла Насреддинь".*
*Подписная цена:*
*На годь - 6 руб.*
*6 месяц - 3 р. 50 к.*
*3 месяц - 2 р.*
*1 месяц - 40 к.*
Adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

**Qafqazda və Rusiyada**
**12 aylığı - 6 manat**

"-----------------------" 6 aylığı - 3 manat yarım
"-----------------------" 3 aylığı - 2 manat
"-----------------------" 1 aylığı - 40 qəpik
*Əcnəbi məmləkətlərdə 12 aylığı - 7 manat*
"-----------------------" 6 aylığı - 4 manat

***Tək nüxsəsi idarəmizdə 10 qəpik, özgə şəhərlərdə 12 qəpik.***

## MƏLƏKİ-NƏQQAL

Bütün şieyi-Əmirəlmöminin ölkələrində əz on cümlə bizim Qafqaz şəhərlərində, ələlxüsus Bakıda mərhum və mərhumələrin sümüklərini gordan gora daşımaq qədimdən bir adətdir. Hər il Kərbəlayi-müəlla ziyarətinə gedən müsəlman qardaşların yüzdə doxsanının torbalarında ya atalarının, ya analarının, qardaşlarının, qövməqrəbalarının sümükləri gərək gedib Kərbəla torpağında dəfn olunsun. Müsəlman qardaşların bu meyit sümükləri daşımaqda nə qədər bica xərcləri olur. Qəbrdən çıxartmaq bir xərc, ehsan verib molla, tüllab çağırıb məzarxanlıq etmək iki xərc, yola salmaq üç xərc… xülasə, bir belə xərci çəkəçəkə Mələki-nəqqala da şəkk gətirmirik. Bu mələk Allah tərəfindən xəlq olunub və onun vəzifəsi Kərbəla torpağına layiq olmayan sümükləri geri götürüb yerinə bir müqəddəs tanrı bəndəsi, əhli-təqva vücudun mübarək sümüklərini aparıb qoymaqdır. Mən sümük daşımaq xərcinə bica deyirəm, çünki əgər biz Kərbəlaya apardığımız sümüklər o torpağa layiqdirlər, onları Mələki-nəqqal özü də bizsiz oraya aparacaq, daha nə lazım xərc çəkmək. Əgər o torpağa layiq deyil, Mələki-nəqqal genə geri qaytarıb əvvəlki qəbrinə qoyacaq. Genə xərc çəkmək lazım deyil. Sözü bir az aydın edək ki, müsəlman qardaşlar dürüst düşünsünlər. Məsələn, Həsənbəy Məlikov üç il bundan qabaq vəfat edib, indi belə güman edək ki, onun övladı istədi onun nəşini Kərbəlaya aparsın, yəqin edək ki, Mələki-nəqqal onun nəşini götürüb birbaş gətirib köhnə yerinə qoyacaq və onun yerində də aparıb Fazil Dərbəndinin mübarək sümüklərini dəfn edəcək. Şəkk yoxdur ki, Mirzə Fətəli Axundov müsəlmanlıqdan kənar bir şəxs idi. Buna da dəlilimiz onun oruc-namazdan uzaq qaçmağı və sarsaq-sursaq komediyalar ortalığa salıb, möhtərəm xanlarımıza, bəylərimizə, üləmamıza, ağsaqqallarımıza sataşmaq idi. İndi belə güman edək ki, Mirzə Fətəlinin övladı onun sümüklərini aparıb Kərbəlada dəfn etdilər. Yəqin

Mələki-nəqqal fövrən onun bədənini çiyninə alıb birbaş gətirib Tiflis qəbristanında yerinə qoyacaq və onun yerinə ya Ağa Bağır Məclisinin və ya Mirzə Ələsgərxan ədrəzəmin mübarək sümüklərini aparıb qoyacaq. Sabir Şirvaninin sümüklərinin yerinə yəqin Ağa Mir Mehdi ilə Seyid Məmmədin mübarək sümüklərini aparıb qoyarlar. Bir para möhtərəm vücudlarımız var ki, onlar dünyadan gedən kimi cənazələrini də yerdən Mələki-nəqqal götürəcək. Məsələn Hacı Molla Baba Qubalı, Yekəqarın Molla Qarabağlı, Molla İsmayıl Axund Qafqazi, Molla Məhəmmədəmin və Mir Məmməd Kərim Bakuyi, Səməd xan Marağayi, Hacı Mirzə Həsən ağa Müctəhidi-Təbrizi, Şeyx Həbib və Mir Paxır ağa Şirvani, bunlar hamısı behişt quşlarıdırlar ki, vəfat edən təki bir baş mübarək bədənləri Kərbəla torpağına azim olacaqlar. Allah tezlik ilə arzularına çatdırsın. Xülasə, bunu demək istərdik ki, bir belə xərc-mərc nə lazım, Kərbəla torpağına layiq olan özü də gedəcək, layiq olmayan min xərc çəksən yenə qayıdıb özünün köhnə qəbrinə gələcək.



Mələki-nəqqal Allahın nurundan xəlq olunmuş bir məxluqdur. Odur ki, biz qara palçıqdan xəlq olanlar onu görməyə qadir deyilik. Ancaq bizim içimizdə Mələki-nəqqalın əmsalı vardırlar, bunlara biz təbibi-nəqqal adı qoyuruq, təbibi-nəqqalların da vəzifəsi həmçinin nəql-köçürtməkdir. Bunlar insanları nağıl evindən axirət evinə köçürürlər və köçmək xəyalına düşən şəxslər köçmək xərcini təbibi-nəqqala öz əllərilə verib, sonra ölürlər. Təbibi-nəqqalların bu keçən vaxtda Bakıda bir mühüm şuraları olmuşdu. Buna səbəb təbib Gindesin neftçilər şurasının xəstəxanasından ixrac olunması idi. Təbib Gindes həman xəstəxanada səkkiz ildir ki, xidmət edir və xəstəxananın körpə uşaq şöbəsi onun ixtiyarında idi. Bu şəxsin təqsiri bu olubdur ki, xidmət edən zaman, neft mədənlərində qulluq etməyənlərin naxoş balalarını qulluq edənlərin balaları kimi qəbul edib müalicə edib. Bu da ağalara xoş gəlməyib, həkimə buyurublar ki, yanına naxoş uşaq gətirənlər əgər neft mədənlərində qulluq edənlər olsalar qəbul et və illa uşağın bir əlindən bir ayağından yapış at palanın ortasına, düşsün qənbərin üstünə. Həkim də bu növ "Ağa buyurur sür dərəyə"ni bacarmayıb ixrac olunub. Gindesin balalar atalarının boynunda çox haqqı olmağına görə, başladılar "Kaspi" qəzetində kağızlar vasitəsilə təbibdən rizamındlik etməyə. Bu rizaməndlik kağızları günü gündən çoxlaşıb axırı bir od olub yapışdı təbibi-nəqqalların canlarına.

Söz yox bu kağızlar Gindesin şöhrətini daha da artırdı və bu da təbibi-nəqqalların mədaxillərinin azalmasına səbəb oldu. O idi ki, təbibi-nəqqallar şura edib "Kaspi" qəzetində Gindes barəsində yazılan kağızlara protesto etdilər. Təbiblərdən ağayi-Krim Terter ayağa qalxıb açıq-açığına dedi: "Həzərat! Müsəlman qəzetində Gindesin adını Loğmani-sani qoyublar. Bundan sonra əvam müsəlmanlar hamısı naxoş uşaqlarını birbaş gətirib Gindesin yanına aparacaqlar. Pəs belə olan surətdə biz məgər anamızın südü ilə dolanacayıq?!" Sonra Ağayi-Aqırqırha ayağa qalxıb təklif etdi ki, qaradovoya şikayət etsinlər, ta ki o gedib qəzetxanalarda Gindes adı çəkənlərin ağızlarını cırsın. Ağayi-Toxmi-xəbbaz, ağayi-Şikəmparə, ağayi-Məğzbadam, ağayi-Gülxətmi, ağayi-Xiyarçənbər, hamısı yanıqlı nitqlər irad etdilər. Bu nitqlərin hamısının mənası bu idi ki, əgər qəzet vasitəsilə təbib Gindes camaatın məhəbbətini cəlb etsə biz nə yeyəcəyik. Qaradovoy qəzetlərə Gindes barəsində gələn kağızları qadağan etdi. Amma təbibi-nəqqalların acığına uşaq xəstəxanası üçün toplanan ianənin qədəri günü-gündən artmaqdadır. Az vaxt keçər ki, təbib Gindesi xüsusi bir uşaq xəstəxanası müdiri görərik. Dilsiz-ağızsız balalar hamisi olan Gindes cənablarına "Molla Nəsrəddin" idarəsi öz səmimi məhəbbətini izhar etməyi müqəddəs vəzifə hesab edir.






*Gəlin elə bir xəlvət küçə ilə gedək ki, üzümüz o dağılmış universitetə sataşmasın və xarabanı görməyək.*




*Ey Allahı sevən! Hər kəs "Molla Nəsrəddin"i oxuya kafir, mürtəd, vələdizzinadır, o şəxs ilə rütubət ilə mülaqat etmək olmaz.*

## ƏŞAR

*(Bəzmi-eyş-nuş yaxud bu gecə)*

Molla, səccadəni atdıq bu gecə
Mey ilə ülfəti qatdıq bu gecə.

Dəxi su içməyi etdik qədəğən
İçginin təmini daddıq bu gecə.

Düzələşdirdik işin hər yanını
Mətləbə, məqsədə çatdıq bu gecə.

İstərik istola hər cins şərab
Ağ dodaqları qızartdıq bu gecə.

Bir-birimizğə piyalə-qədəhi
İttihad ilə uzatdıq bu gecə.

Ləbşəkər saqiyi-ziba pəsərin
Yadına cam boşaltdıq bu gecə.

Ud, ney, tar, kaman çaldırdıq
Qışqırıb həşri qopartdıq bu gecə.

Hər nə ki olmalı idi oldu
Köhnəyə tazə yamatdıq bu gecə.

Başımız doldu, qızışdı aralıq
Çuxanı, börkü çıxartdıq bu gecə.

Pul qutardı kisənin çıxdı dibi
Başmağı, qurşağı satdıq bu gecə.

Pas basmışdı bütün qəlbimizi
Pak sildik, səfalatdıq bu gecə.

Yanmış idi ağacı könlümüzün
Onu bir gunə sulatdıq bu gecə.

Madmazellər ilə keyf edərək
Dan yerin ta ki, ağartdıq bu gecə.

Gün tülu etdi ucaldı fələkə
Onacan biz demə: "yatdıq bu gecə".

Qəhbə dünyanın unutduq qəmini
Xəstə bir könlü ucaltdıq bu gecə.

Nə isə Molla, boş idi yeriniz
Eyş dəryasına batdıq bu gecə.

Millətin dərdini atdıq bu gecə,
Əcəmi, türkü oyatdıq bu gecə.

Ərəbi kürdə calatdıq bu gecə,
Qəlbi-məcruhu sağaltdıq bu gecə.

*Keyfsiz*

## ELAN

İran sərhəddində olan Duşaq tamojnasından elan olunur ki, bu gələn ayın otuz üçündə İrandan varid olmuş və götürülməmiş mal hərraca qoyulub satılacaq. Satılan şeylər bunlardır: həna 3412 kisə, tumanbağı - 5264 düjin, sirkə darağı - 1523 ədəd, hamam fitəsi - 8666 ədəd, Yəzd ipliyi - 3421 batman, Əfşərə qaşığı - 2583 ədəd, dabandaşı - 2894 ədəd, can kisəsi - 9311 ədəd, möhür qabı - 813 ədəd, nanə qurusu - 6245 batman. Bu malı almaq istəyənlər Aşqabada Təkə meydanına buyursunlar.

## SƏBRİBƏYZADƏ XALİD BƏYƏ

Bu da bir töhfə, töhfeyi-digər
Genə mey nəşəsi çıxıb başə

İstər idim ki, vəsfi-hal yazım
Hər nə gördümsə bixəyal yazım

Ta ki, izhar edim kəmal yazım
Leyk təbim qatıbdı su aşə.

Səbribəyzadənin yeri boşdur
Ki öz əksin qıleydi arayiş

Etdiyincə "Şəlalə" gəncayiş
Nəzmü nəsr eyliyəydi fərmayiş
Qələmi hər nədir tökə xoşdur.

Təbimə söylədim bir az, az yat
Yaz bacardıqca şerü nəzm, qəzəl
Dedi: mənə uzatmayır bənə əl
Dedim: ol sən də, ol hərifə bədəl
Səci mənanı büsbütün uzaq at.

*Xortdanbəyzadə*

*Sərçəqulu*

## TELEQRAF XƏBƏRLƏRİ

Aşqabad - Bu gün buranın nataryusxanasında qraf Tolstoyun vəsiyyətnaməsi tapılıbdır. Bu vəsiyyətnamədə qraf cənabları özünün bəhayi dinində olduğunu aşikarən bəyan etdikdən sonra yarım milyon manat Amerikada bəhayi dininin intişarına vəqf edibdir.

Şamaxı - Bu gün vaiz Şeyx Həbib cənabları minbərə savar olub xütbeyi-bəliğ əda edəndən sonra belə bir fərmayiş etdi: Əyyühənnas! Hər kəs "Molla Nəsrəddin" məcmuəsini oxuyur, onun atasından xəbəri yoxdur və o məcmuəni çıxardanların da həm atalarından, həm analarından xəbərləri yoxdur.

Qəzvin - Tazə vəziri-məarif təyin olunmuş Ərfəüttəvilə cənabları Qəzvin vağzalına varid olub darülfünun, darülmüəllimin, məkatibi-edadi və rüşdi müdirləri və şagirdləri tərəfindən təntənəli bir surətdə istiqbal olundu. Şagirdlər uca sövt ilə Rzayi-Daneş həzrətlərinin kəlamından əşar xor ilə oxudular.

## KƏNDLİ

*Bir nəfər şəhrə gələ kəndli qonaq*
*Gətirər süzmə qatıq, qurtlu qabaq*
*Səbribəyzadə gətirdi biz üçün*
*Kəndlərindən Nikolayski zeqaq.*

*Xortdanbəy*

## BİZƏ YAZIRLAR

Vladivastokdan - Bu gün balıqçılar dəryada bir böyük naqqa balıq meyiti tapıb ənvai-müsibət ilə kənara çıxartdılar. 25000 put vəzni olan bu balığın yeddi yüz put piyi təxmin olunur.

## SAXSIQƏLƏM:

Bizə bu mətləbi yazan guya bunu bir qəribə əhvalat hesab edib yazıbdır və halonki Şuşa qalasında canına qurban olduğum ağa Əbdürrəhim ağa Müctəhidzadə cənablarının mübarək göbəyindən və qarnından beş o qədər piy çıxartmaq mümkündür.

**Poçta qutusu**

Bakıda Rahilə: Qarabağda Rəfi adlı bir şəxsi-sail var idi. Bu şəxs dünyada heç kəsin yaxşı olmağını istəməzdi və heç kəsə də duayi-xeyir etməzdi. Deyərdi: bəlkə dua elədim mənim duam müstəcəb oldu. - Nə lazım. Bir nəfər Əzim bəy adlı dövlətmənd adam Rəfiyə on put buğda bağışlayır. Rəfi əllərini götürür yuxarı guya dua eləmək niyyətilə və deyir: "Əzimbəy, Allah, peyğəmbər… tahi nə ərz eyliyim. İndi əzizim, Allah, peyğəmbər sizintək şairləri… tahi nə ərz eyliyim!"

*Müdir və baş mühərrirlər:*
*Cəlil Məmmədquluzadə, Əliqulu Nəcəfov*



*Электроп. Грузинск. Изд.*
*Товарещства Больш. Вамская ул. №21.*




Bular əbədə mənim nəvələrimə oxşamıyırlar




Məndən xəbərləri yoxdur



***Ox… Əsil mənim nəvələrim sizsiniz ki, 7500 il qabaqdan necə qoyub getmişəm elə də qalıbsınız, heç dəyişilməyibsiniz.***

ملا نصرالدین

№ 20 Qiyməti 12 qəpik. МОЛЛА НАСРЕДДИНЪ Цена 12 k. № 20




Rotter

*Ərbabi-təşaür çoxalıb şair azaldı*
*Yox, eylə deyil, şairin ancaq adı qaldı.*

**Adres:** *Tiflis, Davidov küçəsi nömrə 24.*
**Адресъ:** *Тифлисъ, Давидовская, 24.*
**Teleqram üçün:** *Tiflis, "Molla Nəsrəddin".*
**Для телеграммъ:** *Тифлисъ, "Молла Насреддинъ".*
***Подписная цена:***
***На годъ - 6 руб.***
***6 месяц - 3 р. 50 к.***
***3 месяц - 2 р.***
***1 месяц - 40 к.***
Adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

**Qafqazda və Rusiyada**
**12 aylığı - 6 manat**

"------------------------" 6 aylığı - 3 manat yarım
"------------------------" 3 aylığı - 2 manat
"------------------------" 1 aylığı - 40 qəpik
*Əcnəbi məmləkətlərdə 12 aylığı - 7 manat*
"------------------------" 6 aylığı - 4 manat

***Tək nüxsəsi idarəmizdə 10 qəpik, özgə şəhərlərdə 12 qəpik.***

# Ədəbiyyat

İki ildir vəfat edib Sabir,
Onu millət gözəlcə yad eləyib
Ruhunu hər cəhətlə şad eləyib
Qılıb öz qəddarlığın zahir.

Neçə məktəb bina edib adına
Dari-ityam dari-əcəzə açıb
Pulu bol-bol kürur-kürur saçıb
Yetişib min yetim-yesir dadına.

Özünün, oğlunun xüsusunda
Göstərib başqa hümmətü qeyrət
Yaşasın, ölməsin bu cür millət
Daim olsun bu abrusunda.

Bu çalışmaq, bu növ əlləşmək
Gətirib bizləri bu cür qabağa
Fars, türk və ərəb durub ayağa
Ayılıb başlıyıbdı birləşmək.

Günü gündən cəlalımız artır
Olmuruq bir dəqiqə qəflətdə
Qoymuşuq kainatı heyrətdə
Hərə öz səmtinə bizi dartır.

Gah olur hami ingilis bizə
Gah olur dost nemsə və alman.
Olmuşuq yaxşı bəxtəvər insan
Özgələr səy edərlə xeyrimizə.

Bizə lazımdı indi arayiş
Çünkü hər iş gedir qərarında
Özü millət öz ixtiyarında
Eyliyir hər ümuru pirayiş.



Göndərib paytəxti-İranə
Ərfəüddövləni vəzir olsun
Bütün İran ona əsir olsun
Rəhmət etsin Əminüssultanə.

Çox yaşa ey vəziri-daneşmənd!
Çünkü sən çox əminsən həqqa
Sənsən İranı eyləyən əhya
Yox sənintək vücudi-qeyrətmənd…

*Cüvəllağıbəy*



İki ildir ki, Sabirimiz əldən gedib, iki ildir ki, Hop-Hopumuzun mollanümalara, zalım bəylərə, camaat qanı soran tacirlərə, millət qanını şişəyə tutduran xanlara, on dəfə Qurana and içib, andını pozub, axırda məclisi-millini topa tutduran şaha rahatlıq verməyən səsi kəsilib. Övrətlər oxuyurlar: düşmənə xəbər olsun, hasil oldu diləklər. Düşmən sevinir:

Yerlərini qaranlıq istəyən qurdlar öz işlərinə təzədən məşğul olurlar. Mollalar genə həman təkfir torbasının ağzını açıb, küçələrdə təkfiri seltək axıdır, məktəblər divarında bayquşlar, şəbpərələr yuva tikiblər, qiraətxanalarımız salarüddövlə quşunun əlindən tarmar olmuş kəndlərə bənzəyirlər, məclisi-xeyriyyələrimiz acından əriyib çöpə dönüblər! Millət balaları küçələri doldurub, hər küncdə biri durub suala məşğuldurlar. Yer dəliklərinə qaçıb gizlənmiş siçanlar ortalığa çıxıb hər biri bir alicənab olublar. Amma Sabirin xəbəri yoxdur, Sabirin qələmi sınıbdır.

Hanı, yoldaş sənin fəsih dilin, hanı sənin o rəvan, mövzun, ürəyini yandırıb, camaatı güldürən aşarın? Yatıbsan, yuxudasan! Heyf ki, tez yatdın. Təqdiri-qəzayə tamaşa edin: molla babalar, şeyx həbiblər, molla ismayıllar, şeyx fəzlullahlar, şeyx həmidlər, məhəmməd əlilər, kamil paşalar, səməd xanlar tək İslam dəryasını qarışdırıb bulandıranlar yaşaya bildikcə yaşayıb boyunlarını yoğunlandırırlar. Amma bir fəqir, millətini canından artıq istəyən şair vətənindən qovulur, qapı-qapı gəzib özünə maaş yolu axtarır, axırda dərddən ürəyi, ciyəri şişib əhli-fəsadı şad edir. Qəribə haldır.

Söz yox, ölümdən heç kəs qurtarmayacaq. Amma millət xoşbəxtliyinə ciddən çalışan bir vücudun qəflətən ortalıqdan götürülməyi adamı yandırır.

Qəm çəkənlərimiz az, istirahət edib plov yeyənlərimiz çox, oda yanıb vərəm gətirənlərimiz az, bihəya, boynuyoğun, "Millət necə tarac olur olsun" deyənlərimiz çox, camaatın hər tərəfdən işıq gələn yollarını kəsib qaranlığa salıb cibini kəsənlərin hesabı bihəddü payan, amma Sabirimiz bir, o da qara torpaq altında.

İnsan çox davamlı olar: ata ölümünə, qardaş, oğul, qız ölümünə bir növ davam gətirmək mümkündür, amma rəfiq ölümünə davam gətirmək çətindir. İki il keçib bainhəmə hər bir "Molla Nəsrəddin"in nömrəsini açanda yəqin edərsən ki, "Hop-hopun" əşarını görəcəksən. Amma yox, iki ildir Sabir istəkli millətinə "Allah özü sənin fəryadına yetsin", - deyib, həmişəlik gözlərini yumub və bircə dənə ciyərguşəsi olan balasını da bizə tapşırıb deyib: "Yaxşı saxla, səndə əmanətimdir". Görəsən aya bir vaxt olacaqdırmı ki, Sabirə babi, laməzhəb adı qoyub dərbədər salanların övladı öz ata-babalarının hərəkətlərindən xəcalət çəkərlər və bizdə də o insaf olacaqdırmı ki, Sabirin bizə tapşırdığı əmanətini atasına bərabər edək. Yoxsa biz də millət bayquşlarını sevindirib Sabir yolunda ağdan qaraya əlimizi vurmayacayıq. Qoy bayquşlar ulaşsınlar, şəbpərlər dişlərini şaqqıldatsınlar. Mənim onlar ilə işim yoxdur. Amma millət xeyirxahlarını, Sabir adı gələndə gözləri yaşaranları çağırıb deyirəm: "Əl ələ verin, qardaşlar, hümmət edin, Sabirin bizə tapşırıb getdiyi əmanəti tərəqqi düşmənlərinin gözlərinə ox edək! Asarını kəsəyənlərə xörək etməyək və onun əziz qəbrini Nizaminin, Firdovsinin qəbirlərinə döndərməyək. Namus yeridir, qardaşlar!"

*H.Ə.*



*Qardaşım "Xortdanbəy"ə*

## ORUCLUQ

*Əsən dimağıma yenə havasıdır orucluğun*
*Dolan xəyalıma yenə səfasıdır orucluğun.*
*Özümü bu hava mənim genə özümdən eyləyib*
*Dolub fərəhlə can könül nişat paltarın geyib*
*Müsəlman on bir aydır tamam xuni-dil yeyib*
*Təhəssür ilə gözləyib cidasıdır orucluğun*
*Əsən dimağıma yenə həvasıdır orucluğun.*




*Əkinçi - Bari pərvərdigara! Bu molla, seyid və dərvişlər həmişəkilərdi, bəs bu arvada oxşar bığıqırxıqlar kimdirlər?*



*Cəmi dərdlərin dərmanı bu torbaların içindədir*




*Əmi, ayıb olmasın sizdən, bizim Cəfərin anasının qarnı ağrıyır, bir dava verə bilərsənmi qurtarsın?*
*Qadan alım, baş üstə bu saat belə dərman verim ki, bir dəqiqədə naxoşunu dincəltsin.*

Gəlir iyi məşamimə genə plov qovurmanın
Edibdi ətri hissiz məni cığırtma, dolmanın
Alıbdır əldən ağlımı qoxusu həm müsəmmanın
Əriştə, firni, paldası, yuxasıdır orucluğun
Əsən dimağıma yenə havasıdır orucluğun.

Açılmadan yavaş-yavaş dəhnələri qazanların
Çəkilmədi, qulaxları qəzet-quzet yazanların
Ucalmada səmalara həvaları əzanların
Hər evlidə, hər ovluda sədasıdır orucluğun
Əsən dimağıma yenə həvasıdır orucluğun.

Olan müsəlman eyləməz dirəng olan zaman sühur
Durar pilov yeməkliyə başında eşq, ürəkdə şur
Oxur səhər duasını alar əvəz behişt, hur
Yatan bu fikr ilə, hər gədasıdır orucluğun
Dolan bütün könüllərə səfasıdır orucluğun.

Xoşa ona ki, saxlayır oruc bu isti günləri
Acından əqli puç olur çürükləyir beyinləri…
Gedir özündən on kərə gülümsəyir görənləri
Fəda o canə kim o can fədasıdır orucluğun
Əsən dimağıma yenə həvasıdır orucluğun.

Vay ol kəmetiqada kim ulaşmıyıb səadətə
Nəimi-axirət üçün sarılmayır ibadətə
Təmuzi tutmayıb oruc yetişməyir şəhadətə
Kimin behişt, hur xoş bəhasıdır orucluğun
Əsən dimağıma yenə həvasıdır orucluğun.

Qənilər ilə mollalar bu ayda bəxtiyar olur
Açımda gündə bir evə taqım, taqım yürür, dolur
Yeyər-içər, doyar-qoşar bu xəlq istəyir bulur
Fəqət fəqirü yoxsulun dodağı gün kimi solur
Sühur açım yavan çörək qidasıdır orucluğun
Fəqirin əski örtüsü libasıdır orucluğun
Məni qıcıqlayan fəqət burasıdır orucluğun
Burasıdır orucluğun, burasıdır orucluğun.

*Kefsiz*

**SETAR**

və yaxud

**ÜÇTELNAMƏ**

Müğənni, al ağuşuna çal setar
Ərənlər deyib üç gərək hər nə var
Birisi ikisiz gətirməz yeriş
İkisi də bir olmasa görməz iş.

Setarı çalıb könlümü şad qıl
Məni tari-fikrimdən azad qıl.
Bu üç tel ki, dil verdilər bir-birə
Mahal əmridir qəlbə möhnət girə.

Cahan üçtel ilə tərəqqi tapar
Əgər olsa bir, ya iki yan sapar
Bir olsa, iki, iş qalar natəmam
Əgər üç ola iş bitər vəssəlam.

Çal üç tarı üçləşdi dilxahımız
Yetirdi bizə üç şey Allahımız
Daha yoxdu Qafqaza xövfü həras
Ki təcdid olub köhnə həmamü tas

Ləhül həmd Baku bakuh ü kin
Benami-xudavənd can afərin
Olub Qafqaza mərkəzi-intibah
Üç etdi tərəqqi yolun vah-vah.

Biri şərhi-Qurani-Mammed Kərim
Demə şərhi qəsdən edibdir səqim
Deyil kinə əhli, deyil əhli qal
Onun var talantı odur bimisal.

Kişidir, kişidir, kişidir, kişi
Bu xalqa kəbin kəsmək onun işi
O baş kim onun var böyükdür, böyük
Get indi nə qədri döyüksən döyük.

O Quran ki, ecaz idi sərbəsər
Bu əmdən onu etdi zirü zəbər.
İkinci kitab "Gülüstan" idi
Ki çox müşkül idi nə asan idi.

Onun da olub şarihi boz öküz
Yaxıb Sədini etdi qəbrində köz
Nə qandı, nə qandırdı Şeyxin sözün
Qayırıdqda qaşın çıxartdı gözün

Çəkib əksi-mənhusun ancaq özün
Bərəltdi, ağartdı işıqsız gözün.

Gərəkdir "Gülüstan"a çəkmək hasar
Girib yolmasın güllərin hər himar
Ədib oldu Xərrat Rahilü hil
Failin-failin-failin-fail.

Üçüncü ədibi xuda saxlasın
Ki bir qədər də artıq axmaqlasın
Odur Seyyid Zərgər ey dustan
Ki qıldı bizə tərcümə "Bustan".

Nə zor mədən imiş bu Bakı məgər
Ki qazdıqca hər nə dilərsən çıxar
Əgər tək qalaydı Muxammid Kərim
Ülumü məarif qalardı əqim.

Çücüt oldu ürfan uyuşdu bir az
Camaat yavaşca duyuşdu bir az
Üçüncü tamam açdı tökdü çölə
Düşündü hamı Məşqətə, Bülbülə.
Kələm dolması, şor balıq, göy soğan
Yaşa ay belə "Zərgər" oğlan doğan

Qılıblar bu üç zati-alinəhad
Səmadə xuda, yerdə Sədini şad.
Be behri-təqarüb təqərrüb nümay
Bədin vəzni-mizan təbi-azmay
İlahəst Allah, rəhman xuday
Ze Quran, "Gülüstan"ü "Bustan" səray.

Karim əstü Rahilü Dülgər se nam
Bakı tapdı bunlarla zibi-təmam
Setarın yeri indidir, mütrüba
Hamı balığa rusca derlər riba
Ərəbcə zəqaq, farsca türkcə küçə
Cəğalə oxut məğfirət bu üçə.

*Xortdanbəyzadə*

*Sərçəqulu*

**POÇTA QUTUSU**

Aşqabadda "Naqiz"ə – Mirzə Əli Məhəmməd Babın həqqaniyyəti barəsində yazdığın məqalə məsləkimizə müvafiq olmadığından dolayı dərc edilmədi. Bu cür əkslərdən tez-tez göndərməyiniz rica olunur.

*Müdir və baş mühərrirlər:*
*Cəlil Məmmədquluzadə, Əliqulu Nəcəfov*



*Электроп. Грузински. Изд. Товарщества Больш. Ванкская ул. №21*




**_Cəmal mübarək! Mələkutdan lövh nazil olmuş. Ruhülqüdüş şərəfyab olmaq istəyir._**
**_De getsin sabah gəlsin, bu gün vaxtım yoxdur, ibadətə məşğulam._**

24 rəmazan 1331 **Səkkizinci il** 14 августа 1913 г

# ملا نصر الدين

**№21 Qiyməti 12 qəpik.** МОЛЛА НАСРЕДДИНЪ **Цена 12 к. № 21**

***Buxarada bəzm***



*Baybeçə xürsənd qıl* *Mövla! Təqsiri-qənd qıl!*

**Adres:** *Tiflis, Davidov küçəsi nömrə 24.*
**Адресъ:** *Тифлисъ, Давидовская, 24.*
**Teleqram üçün:** *Tiflis, "Molla Nəsrəddin".*
**Для телеграммъ:** *Тифлисъ, "Молла Насреддинъ".*
***Подписная цена:***
***На годъ - 6 руб.***
***6 месяц - 3 р. 50 к.***
***3 месяц - 2 р.***
***1 месяц - 40 к.***
Adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

**Qafqazda və Rusiyada**
**12 aylığı - 6 manat**

"-----------------------" 6 aylığı - 3 manat yarım
"-----------------------" 3 aylığı - 2 manat
"-----------------------" 1 aylığı - 40 qəpik
*Əcnəbi məmləkətlərdə 12 aylığı - 7 manat*
"-----------------------" 6 aylığı - 4 manat

***Tək nüxsəsi idarəmizdə 10 qəpik, özgə şəhərlərdə 12 qəpik.***

# Ədəbiyyat

Deyirlər çıxdı bir gün Tura Musa
Münacat etdi key məbudi-yekta
Özün məcmui-dünyanı yaratdın
Bu milyon-milyon insanı yaratdın

Nolur lütfün ola şamil ki mən də
Sənintək xəlq edim bir nazlı bəndə
Qəbul olsa mənim bu iltimasım
Dəxi dünyada yox xövfü hərasım.

Kəlimüllaha oldu vəhy nazil
Böyük bir mərhəmət haqqında şamil
Dedi verdim sənə hər ixtiyarı
Nə istərsən elə hökmündü cari
Yoğur insana oxşar bir şəkil yap
Düzəlt hər bir yerin insan kimi lap.

Vücudu, cəmdəgi, çiyni, qulağı
Qolu, dirsəkləri, boynu, buxağı.
Başı, beyni, qıçı, qarnı sərasər
Ki olsun büsbütün insana bənzər
Sən et bu şəkli torpaqdan kəşidə
Edər Cəbrail öz ruhun dəmidə.

Eşitcək bu sözü Musa sevindi
Yerindən sıçradı aslana döndü
Qolunu çırmadı açdı dolağın
Soyundu paltarın atdı papağın

Qazıb yerdən bir az torpaq çıxartdı
O torpağa beş-on kuzə su qatdı.
Yoğurdu palçığı bir çəngə qapdı
Nasıl əmr olmuş idi elə yapdı
O palçıqdan düzüb bir heykəl etdi
O dəm Cəbrilə göydən vəhy yetdi

Gəlib ol heykələ nəfx etdi bir ruh
O heykəl nitqə gəldi oldu ziruh
Atıldı düşdü fırlandı yumuldu
Çığırdı, qaçdı hər səmtə cumuldu.

Bu işdən düşdü Musa iztiraba
Vücudu titrədi daldı əzaba
Dubarə yalvarıb qıldı münacat
Məni yarəb bu bəndə eyləyib mat
Sənin xəlq etdiyin cümlə bəşərdə
Bu cür yüngül səfeh yox bir nəfər də
Nədən bu tutmayır bir ləhzə aram?
Mənə bu hikməti gəl eylə əfham.

Yetişdi həzrəti-Musayə ilham
Bu minval ilə göydən gəldi peyğam
Ki sən allahlığa bixud can atdın

*Yaratdın bir nəfər, naqis yaratdın*
*Yadından bir işi qıldın fəramuş*
*Onunçun bunda yoxdur zərrəcə huş*
*Beyin çun qoymayıbsan sən bu başa*
*Özünü öldürüb düşmə təlaşa.*
*Olub insan bu insana qoşulmaz*
*Dürüst anla beyinsiz adam olmaz*
*Dəxi keçdi əməl fövt oldu fürsət*
*Dilərsən olmasın bir nəfsə zəhmət*
*Apar at bir çuxur məvada qalsın*
*Yesin, içsin gözəl bir övrət alsın*
*Törər nəsli olarlar bir bölük hiz*
*Salarlar bir şəhər məşhur be Təbriz*
*Yeyər ol şəhrin əhli çoxlu paxla*
*Beyinsizdir onlar yadında saxla*
*Bir eşşək mindirib bir eşşək üstə*
*Tutarlar sağ solun dəstəbədəstə*
*Biri anqırsa etsə bir nümayiş*
*Ona səcdə edərlər həm sitayiş*
*Deyərlər müctəhiddir ya imamdır*
*Bir anqırmaq kifayətdir, tamamdır*
*Olardan umma sən əqlü fərasət*
*Olar kani-səfahətdir, səfahət.*

*Cüvəllağıbəy*

## FİRİDUNİYYƏ MƏKTƏBİ

*Güllər gülür, fəğanla keçir ömri-əndəlib*
*Bimar-ehtizarda ücrət dilər təbib.*

Yəni Aşqabadda "Firiduni" şkolunun möhtərəm azaları nə qədər dad-fəryad edirlərsə və nə qədər camaata yalvarılarsa ki, ay canım amanın bir günüdür qoymayın şkol bağlansın, balalarımız küçələrdə qalsın, bu nalələrin müqabilində həkimbaşı Mexdiyev, Quseynov Vallaş, saz çalan Hacı Nəsir, ləzgioğlu Hacı Məcid, dəriçi Hacı Həmid bir də bir naxır günortadan sonra kişi olan boynuyoğunlar durub baxırlar, hır-hır hırıldayırlar, hallarına zərrəcə də təfavüt eyləmir. Bədbəxt işkol xırıldaya-xırıldaya can verdiyi bir halda bir tərəfdən də taxta-şalban satanlar və başqa tələbkarlar yapışıblar Sovetin yaxasından ki, işkolanın borcunu verin yoxsa şikayət eləyib işkolu satdıracayıq. Hörmətli əzalar da qalıblar mat-məəttəl. Əliyev Əhmədin, bakılı Hacı Məmməd Rzanın qeyrətlərindən şkolun bir tək qəpiyi yoxdur ki, köhnə borclara verilsin və müəllimlərin gələcək məvacibləri təmin edilsin.

*Manəndi-laşə nəş təvangər zəlilü xar*
*Gər kəs misali-varisi-qüssal naşəkib.*

Demək ki, bir iki para xəsis dövlətlilərin azarlıları dərmansızlıqdan can verdiyi kimi sevgili "Firiduni" şkolası da pulsuzluqdan ömrünü aşqabadlılara bağışlayır, amma pəzəvəng hamamçı Hacı Əbdüləlinin, tənzilçi Hacı Yusifin heç bir veclərinə gəlmir ki, qoymasınlar yazıq dünyadan nakam getsin və Cəlil Kazımov, Şadlıq Əli, Mirzə Allahverdi bir adı da Boğdan hazırlaşırlar ki, işkol dünyadan rehlət edəntək quzğun kimi onun nəşini darbadağın dağıtsınlar və həman otaqlarda çillədə "çillə" çıxardıb novruz bayramında da klaslara şirni düzsünlər.

*Balini-nazə xaceyi-şəhr eylər ittika*
*Xaki-məzəllət üzrə yatır ac yüz qərib.*

Evin yıxılsın şair gör nə qiyamət eyləyib, yəni Ömər Xacə Nizamov zərli mütəkkəyə söykənib təzə aldığı on dörd yaşında tatar qızı ilə mülaibə edir və bankların, tacirlərin, fəqir-füqəranın pullarını əllərindən alıb yeyir və heç bilmir hansı xanın dövrüdür. Amma yazıq tələbkarlar əlləri qoyunlarında, boyunları çiyinlərində ac-susuz qalıblar Xacə sarayının küncündə,

*Bəstərnəvaz izzü səfa əhməqi-xəsis*
*Gülxənnişin zillü həva aqili-ədib*

Siz Allah görün nazim nə gözəl nəzmə çəkib? Yəni aşpaz Qurbanın Heydər Rəhimi ilə Qıllı Həzinin İsa Musası vətənpərvərlik edib qeyrətsizlik damarlarını yoğunladanda və mürtəcelərin rəhbərləri xainlərin xadimi Dəlləkzadə Həsən fars möhtərəm "Müzəffəri" işkolasına əza seçiləndə gərək ağayi-Münir kimi dahiyi-ədəb qalsın kənarda və "Firiduni" işkolası da həsrət ilə can versin.

*Məqbuli-bəzmi söhbət olur müfsidi-ləim*
*Mənfuri-təbi-aləm olur nasehi-müsib*

Bütün İslam aləmində, xüsusən, Aşqabadda nə qədər danosçu, alçaq, ləim, bij, anasının əmcəyini kəsən, məscidin, işkolun, millətin pulunu yeyən varsa hamısı ehtiram, izzət sahibi olurlar, amma fazili-kamil, həqiqi millətpərəstlər avamın gözlərinə pis görsənirlər.

*Kənarda aşnasıyla*




*Bağışla xanım bir qələtdi eləmişəm…*

*Evində arvadıyla*



*Köpək qızı bu saat gönünü soyaram…*

Dövlətli evində iftar



*Kasıb evində iftar*




*Əgər dəstəm rəsəd bər çərxi-gərdun*
*Əz u porsəm ki, in çun əst an çun*

*Veribsən ağbaşa min nazü nemət*
*Fəqirin loğması aludə dər xun.*

**Necə ki:**

Bir şairin məişəti nöqsanpəzir olur
Bir ağbaşın ümuri edir kəsbi-ərrü zi

Burada beyti münasibi-məqam oxuyub qarelərə dua edirəm.

Subhanə mən təhayyəra fi sanatil-uqul
Subhanə mən biqudratihi yəcuzil-fuhul.

*Xortdanbəy*

*"Şəlalə" ədəd 19*

**MÜTƏŞAİR**

*Həmiddən qalma bir cəhrə*
*Salıbdır küy-kələk şəhrə*
*Təmiz baş-beynimiz getdi*
*Dönüb qəndabımız zəhrə.*

*Dayazdır fikrinin çayı*
*Qırıqdır fəhminin yayı*
*Qırıq yaydan dayaz çaydan*
*Olarmı bizlərə bəhrə?!*

*Bu ayrandan kərə çıxmaz*
*Uşaqlar əppəyə baxmaz*
*Çürükdür ayranın, Xalid!*
*Əbəsdir çalxama nəhrə.*

*Oxursa bağda bülbüllər*
*Olar xəndan qızıl güllər*
*Sənin sövti-nəhiqindən*
*Nə gül açmaz, nə də zöhrə*

*Anatoldur sənin yurdun*
*Bu yerdə nafilə durdun*
*Gedib ormanda hizüm qır*
*Gətir satmaqlığa şəhrə.*

*Mənim məqsudumu anla*
*Düşün, qan, sonradan banla*
*Xoruz gər banlasa vaxtsız*
*Düşər əlbəttə bir qəhrə.*

*Hörümçək lanəsi qurma*
*Qanın cansızların sorma*
*Zəifdir, sısqadır, loşdu,*
*Təni-millətdə yox şəhrə.*

*Doluxsunma, yemə çox qəm,*
*Gərək qəmnak ola "Xürrəm"*
*Kişi dünyada şad olmaz*
*Olar giryan gələn dəhrə.*

*Xortdanbəy*

**TELEQRAF XƏBƏRLƏRİ**

Şuşa - Rövzəpəz (qaragöz) Hacı Əbdüləli Şirvani həqiqətdə bu axır vaxtlarda məscidimizdə səhih və gözəl rəvayətlər oxuyub zikri-müsibət ilə camaatı nəhayət dərəcədə feyziyab edir. Qarabağ əhlinin onun haqqında ixlasi-iradətləri kamildir və hamısı o güsaleyi-süxənguyə səddəqna və amənna deiyrlər.

Hərçənd bu vücudi-mübarəki cavanlığında şəhərimizin cahılları bir dəfə oğurlayıb bir ay məhzi bir də gizlədiblərsə də, lakin onun barəsində məhəbbət və mehribançılıqdan başqa heç bir təcavüz olunmayıbdır.

Naxçıvan - Buranın mollaları mitinq edib qərar qoyublar ki, bu il rəmazan yarmarkasını bütün-bütünə Çakər cənablarına mühəvvəl etsinlər və daha heç bir mərsiyəxanın orada ticarət haqqı olmasın.

Röyter ajansının verdiyi teleqrafi xəbərinə görə Çakər bu ilin cəmi mədaxilinə özünə bir dəst ovçu paltarı, bir əlquşu və bir cüft tazı tədarük edəcəkdir.

## GİMNAZİST

*(Xalis mömininin zəbanhalı)*

Ey gözümün nuru, malay gimnazist
Rəngi günəş, çöhrəsi ay gimnazist.

Lütf ilə baxma mənə biganətək
Eylədi hicrin məni divanətək
Girmişəm eşqinlə bu meydana tək
Yandı canım şövqilə pərvanətək
Atəşi-eşqində haray, gimnazist,
Ey gözümün nuru, malay gimnazist.

Aşiqəm ol zülfi-səmən paşına
Əyri kamantək o qara qaşına
Qurban olum qüdrəti-nəqqaşına
Halıma rəhm et, dolanım başına
Gəl işimi eyləmə zay, gimnazist
Rəngi günəş, çöhrəsi ay gimnazist.

Məndən ötür xaliqi-qüdrətnüma
Xəlq eləmişdir səni ey məhliqa
Ağ yüzünə, qaş gözünə mərhəba
Mən sənilə şad oluram daima
Ruzü şəb, həftə vü ay, gimnazist
Ey gözümün nuru, malay gimnazist.

Gərçi xuda xəlq eləyib canları
Cənnətara sevgili qılmanları
Şad qılıb cümlə musurmanları
Leyk inanmam belə dastanları
Orda da olmaz sənə tay, gimnazist
Ey gözümün nuru, malay gimnazist.

Uf, nolar ey bülbülümün gülşəni
Vəslin ilə şad qılaydın məni
Ox deyib ağuşə çəkəydim səni
Gültək öpəydim o gözəl çöhrəni
Sən də deyəydin ki, oxay, gimnazist
Ey gözümün nuru, malay gimnazist.

Qoymagilən dərdimi bilsin ümum
Başqa təşəbbüslərə yoxdur yolum
Var sənə verməkliyə bir az pulum
İştə budur cibdə olan var-yoxum
Algilə hər neçədi say, gimnazist
Bircə öpüş ver mənə pay, gimnazist.

*Dəstançı*

## ORENBURQ XƏBƏRLƏRİ

"Din və məişət" jurnalının xəbər verdiyinə görə Osmanlı əsgəri 4444 ədəd dualı silah sayəsində Ədirnə şəhərini təkrar zəbt etmişlər. Şimdi bütün bolqar məmləkətini zəbt etmək üçün şeyxülislam cənabları 8888 ədəd tilsim icad edir.

Şəhər bir ay voyenni palajeniye elan olunubdur. Məcburi rövzə tutdurmaq cəmiyyəti bu sənə artıq ciddiyyət ilə iş görür. Sokaklarda oruc yeyən adam görüldüyü kimi polis vasitəsilə dar ağacına yollanılır.

## DƏYƏNƏK

*Orucyeyənlərə kəc-kəc baxan, oruc qardaş!*
*Bir azca hövsələ bas səbr elə darıxma yavaş*
*Beş on gün ömrünü dünyada zəhmət ilə keçir*
*Öləndə qorxma gedərsən behiştə sən birbaş*

*Cüvəllağıbəy.*

*Müdir və baş mühərrirlər:*
*Cəlil Məmmədquluzadə, Əliqulu Nəcəfov*



*Электроп. Грузинск. Изд. Товаоищества Больш. Ванкская ул. №21*




***Aşqabadda***
***Haləti-ehtizarda olan "Firiduniyyə" məktəbi***

27 şəvval 1331 Səkkizinci il 16 сентября 1913 г.

# ملا نصرالدین

№22 Qiymәti 12 qәpik. МОЛЛА НАСРЕДДИНЪ Цена 12 k. № 22



**Adres:** *Tiflis, Davidov küçəsi nömrə 24.*
**Адресь:** *Тифлись, Давидовская, 24.*
**Teleqram üçün:** *Tiflis, "Molla Nəsrəddin".*
**Для телеграмм:** *Тифлись, "Молла Насреддинь".*
***Подписная цена:***
***На годь - 6 руб.***
***6 месяц - 3 р. 50 к.***
***3 месяц - 2 р.***
***1 месяц - 40 к.***
Adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

**Qafqazda və Rusiyada**
**12 aylığı - 6 manat**

"-----------------------" 6 aylığı - 3 manat yarım
"-----------------------" 3 aylığı - 2 manat
"-----------------------" 1 aylığı - 40 qəpik
*Əcnəbi məmləkətlərdə 12 aylığı - 7 manat*
"-----------------------" 6 aylığı - 4 manat

***Tək nüxsəsi idarəmizdə 10 qəpik, özgə şəhərlərdə 12 qəpik.***

*CİDDİ*

## ANA DİLİ

Xeyli vaxtdır ki, dil məsələsi məhəlli-müzakirəyə qoyulub, onun üstündə məclislərdə, qəzet sütunlarında və jurnallarda bəhs olunur. Kimi İstanbulda işlənən ədəbi dili təhrif edib onu sair yerlərdə işlənən türk dillərinə tərcih verir. Kimi Azərbaycan türklərinin şiveyi-lisanını bəyənib onun tərəfini saxlayır. Bir paraları da İbn Yafəs kimi türklər üçün ümumi bir dil təsis etmək fikrindədirlər ki, hər yerdə o dildə danışılıb yazılsın.

Hər kəs öz iddiasında möhkəm durubdur. Bəzi dəlillər gətirmək ilə öz qövl və rəylərini həq bilir, qeyrilərinin qövl və rəylərinə iltifat və etina etmək istəmir. Bu hal ona səbəb olubdur ki, nə qəzetlərimizin müəyyən dili var, nə yazıçılarımızın ki, oxuyanlar da onu anlayıb başa düşsünlər, o dili sevsinlər və öz malı hesab etsinlər, övladına o dildə təlim və tərbiyə versinlər. Bizim əqidəmizcə bu məsələdə uzaq getmək lazım deyil.

Hər millətin özünə məxsus ana dili var ki, onun məxsusi malıdır. Ana dili millətin mənəvi diriliyidir. Həyatının mayası mənziləsindədir. Ananın südü bədənin mayası olduğu kimi ananın dili də ruhun qidasıdır. Hər kəs öz anasını və vətənini sevdiyi kimi ana dilini də sevir.

Bu, Allah təalanın gözəl nemətlərindən birisidir. Onu əziz və möhtərəm tutmaq hər kəsə borcdur.

Rusların məşhur pedaqoq və ədibi Uşinski deyir: bir millətin malını, dövlətini və hətta vətənini əlindən alsan ölüb-itməz, amma dilini alsan fövt olar və ondan bir nişan qalmaz. Bu doğrunu sair millətlərin həqiqi ədibləri və yazıçıları yaxşı anlayıblar və əsərlərini ana dilində yazmaqla belə millətin əxlaqını düzəldib ağlına və ruhuna tərbiyə veriblər və verməkdədirlər və bir tərəfdən də ana dilinə sığal verib onda olan rəkakəti götürüb, gözəlləşdirib müəyyən bir qanun və əsas üzrə onu möhkəmləşdiriblər.

Rus dilini böylə müntəzəm qanun və qaydaya salan və bu dərəcədə onu geniş və zəngin edən onun ədibləri olubdur. Hansı rus ədibi olursa olsun onun yazdığı əsərləri rus əkinçisi, rus dehqanı oxuyub asanlıq ilə başa düşür. Habelə də nemsə, firəng, ingilis və bizim Qafqazda: gürcü, erməni ədiblərinin dilləri. Amma İstanbulda nəinki ədiblərin, hətta balaca bir qəzetdə xəbər yazan hərifin dilini İstanbuldan başqa sair yerin türkləri anlamaz. Bundan məlum olur ki, osmanlı ədibləri ana dilinin qədrini bilməyib onu unudublar və özləri üçün başqa və illa yox ittixaz ediblər.

Bizim Azərbaycan türklərinin dəxi özlərinə məxsus dili vardır. Uzun müddət İran dövlətinin nüfuzu altında yaşamaqla belə bizim dilimizə bir növ fars dilinin qanun və qaydası sirişt edibdir. Amma bununla belə dilimizi o qədər qəliz və dolaşıq etməyibdir ki, onu anlamaq olmasın. Bəlkə dili bir dərəcədə dövlətləndiribdir. Doğrudur bizim qabil və mahir ədiblərimiz az olubdur, amma olanlar ana dilini cani-dildən seviblər və yazılarını açıq-aydın yazıblar: Abbasqulu ağa Bakıxanovun "Nəsihətnamə"si, Mirzə Fətəli Axundovun komediyaları, Qasımbəy Zakirin məktubatı, Hacı Heybətbəy Fədanın "Məkkə səfərnaməsi", Hacı Seyid Əzimin mövzun əş'ar və kəlamı, Həsənbəy Məlikzadənin ülum və fününa dair yazdığı kitablar və siyasi məqalələr cümləsi açıq və aydın dildə yazılmış əsərlərdir.

Amma bu axır vaxtlarda bizim açıq və sadə dilimizə İstanbulda yarımçıq elm təhsil edib gələnlər xələl yetirməkdədirlər. Bu cənablar nə elmdən elm və nə mərifətdən mərifət öyrənməyib və adlarına əlqab olaraq bir quyruq yapışdırıb qəliz ibarələr atına minib ədəbiyyat meydanında cövlan etməkdədirlər.

*(Genə olacaq)*

*FİRİDUN KÖÇƏRLİ*

## PATİ JURNAL

*Oxuculardan xahiş olunur bu pati jurnalı öz havası ilə oxusunlar*

*Cəlalxaliq cəlalxaliq*
*Gör nə gözəl can yaradıb*
*Bircə ovuc müsəlmandan*
*Min cürə heyvan yaradıb.*

*Bir dəstə qırmızısaqqal*
*Biri molla, biri çaqqal.*
*Biri seyid, biri baqqal*
*Hamsını şeytan yaradıb.*

*Yaşa Bakı şəhri, yaşa*
*Fəxr elə yüz min o başa*
*Hərəyə bir Saşa, Maşa*
*Tari bir ehsan yaradıb.*

*Edim hansı tərifini*
*Yazım hansı tövsifini*
*Hacı Qasım hamamını*
*Jivoy qəbristan yaradıb.*

*Bulvar ara hacılara*
*Məşhədi kablayılara*
*Kupalnidə çimmək üçün*
*Min malay oğlan yaradıb.*

*Xorasana gedənlərə*
*Beçəbazlıq edənlərə*
*Qılmanları sevənlərə*
*Bakını rizvan yaradıb.*

*Cırtdan*

## TELEQRAF XƏBƏRLƏRİ

Batum - Yeni zakon möcibincə saat onda qəhvə dükanları qapanır. Gecələr saat üçə kimi əngə verən camaat arasında həyəcan görünür. Min dörd yüz Osmanlı qəhvəsi, min üç yüz İran tiryakxanalarının müdavimləri böyük bir mitinq yapıb hümməti-ğəyuranə ilə bundan sonra gecələri hamamlarda keçirtməyə qərar verdilər.

## PRİSTAV VƏ OĞRU

**Pristav** - A gədə, sən qəribə bihəyasan! Neçə dəfə mənə söz veribsən ki, oğurluq etməyəsən. İndi bu nə işdi bu kasıb bədbəxtin öküzünü aparıb, binəvanı əli qoynunda qoyubsan.

**Oğru** - Bəy, and olsun o görükən imamzadəyə mənim xəbərim yoxdur.

**Pristav** - A gədə, utanmayırsan, and da içirsən? Doğrusunu de görüm sənmi aparıbsan?

**Oğru** - Bəy, and olsun səni-məni yaradan bir Allaha, and olsun Allahın Quranına, xəbərim yoxdur.

**Pristav** - Doğrusunu de, yoxsa səni yıxdırıb o qədər döydürərəm ki, bir ay yorğan-döşəkdə qalarsan.

**Oğru** - İxtiyarın var, ay bəy, amma and olsun on iki imama xəbərim yoxdur.

**Pristav** - Pəs belə? *(Qaradovoylara)* Ay uşaqlar, vurun bu məlun oğlu məlunu! *(Qaradovoylar oğrunu yıxıb çox döyürlər).*

**Oğru** - Ağa, qurbanın olum, qoyma məni öldürsünlər, doğrusunu deyim.

**Pristav** - A gədələr, əldən qoyun. (*oğruya*) Dur ayağa görüm.

**Oğru** *(ayağa qalxıb)* - Ay ağa! Öldürmə məni, and olsun atam getdiyi Kərbəlaya, xəbərim yoxdur.

**Pristav** *(qaradavoylara)* - Siz çıxın çölə! *(Oğrunu yaxına çağırır)* Lotu, mən ölüm de görüm öküzü sənmi aparıbsan?

**Oğru** - Ağa, qurbanın olum, mən ölüm niyə deyirsən? Min elə öküz qurban olsun sənin bir tükünə, mən aparmışam.

Qarabağda bir seyid




*Sən bir-iki saat belə uzan!*

*Camaat, bir nəfər seyyidə bizim evimizdə ac və çılpaq uzanıb, ona ianə lazımdır. Hər kəs hər neçə versə birə min bu dünyada, birə min axirətdə əvəz alacaq.*

## ƏŞ'AR

*(Süleyman Nəzif bəyə)*

### BİRLƏŞMƏ

Dedilər birləşir müsəlmanlar
Arnaud, türk, laz, fars, ərəb
Çəkilir işbu yolda güclü təəb
İşləyir bir əl ilə həp bunlar.

Elənir bir tamam məzhəblər
Maliki, şafe, hənbəli, hənəfi.
Dikəni, tiri, qanqalı, ələfi
Bağlıyırlar "dəmət" necə güli-tər.

Şiə, sünni sözü danışmıyaraq
Dedilər millət ittihad edəcək
Ancaq Allahı, dini bir biləcək
Əldə haqqın kitabını tutaraq.

Olamaz böylə iş dedim hərgiz
Buna mən doğrusa inanmıyıram
Əfv edin bəlkə mən də qanmıyıram
Birləşərmi bu beş məzahibimiz?!

Vay-vay... ölmüşmü... Hacı Mir Bağır?!
Kim, tuta böylə bəd əməllər baş
Kəsilə bəhsi-məzhəb ilə dalaş
Öz qüvasilə din ola zahir?!

Ya Süleyman həmi Nəzif bəyin
Buraxarmı o od tökən qələmi?
Birləşə sünni, şiə, türk, əcəmi,
Edəsən hər nə istəyir ürəyin?

Bax, Süleyman Nəzif bəy buyurur:
Türk əgər bütpərəst, şiə ola
Sünni türkəm qızımı verməm ona
Şiə, ya bütpərəst birdi deyir.

Həmi şair, həmi ədib, alim
Həm birincilərindən islamın
Pişgahında halı əqvamın
Nə deyir gör nə söyləyir zalım?

Kəj yola sapdıran bizi molla
Bəxtimizdirmi ya təəssübümüz?
Cahil, alim, böyük, kiçik, həpimiz?
Böyləyiz, böylə getsə... vaveyla!

*Keyfsiz*

## FELYETON

### MARALLARIM

*(Acından təbib)*

Şuşa uyezdi ilə İrəvan quberniyasının arasında düşən böyük bir mahala Zəngəzur mahalı deyirlər. Bu mahalın çox yerləri dağıstandır və əhalisi də kürddürlər. Camaatın peşəsi qaramal saxlayıb yağ-pendir satıb onunla güzəran keçirtməkdir. İlin səkkiz ayını Zəngəzur yollarını qar basır və tərəddütləri kəsər, ancaq dörd ay Zəngəzur yolları şenlik olar. Aran tərəkəmələri qoyunlarını oraya yaylağa apararlar: alış-verişçilər dəstə-dəstə gedib kürdlərdən yağ, motal alıb satış üçün Qarabağa gətirərlər.

Kürd camaatı dünyadan uzaq olmağa görə pula nə qiymət qoyarlar və nə də pulun hesabını bilərlər, ələlxüsus övrətləri, yağı və pendiri dəyər-dəyməz qiymətinə cürbəcür arşın malına dəyişərlər. Odur ki, oraya yağ almağa gedən bir atı güzgü ilə, üsküklə, ucuz üzüklər ilə, saqqız ilə və sair bu ənva şeylər ilə yükləyib yola düşər və qayıdan vaxt tamam bir at yükü lətif sarı inək yağı gətirər. Bu sətirləri tacirlərimizin ittilaı üçün yazıb keçirəm mətləbə.

Bir gün may ayının ortalarında iki yoldaş - mən və Kərbəlayı Məmməd, yağ almaq niyyətilə bir qədər çərçi malı götürüb Zəngəzur tərəfə rəvanə olduq. Turşsu deyilən yerə çatanda bizə aclıq əl verdi. O yan-bu yana bir ev qaraltısı da olsun görmədik. Pənah Allah deyib bir qədər də yol gedib gördük Zarıslı kəndinin altına bir böyük tərəkəmə köçü düşüb. Köçə tərəf yeriş edib köç sahibindən çörəkdən süddən istədik. Qapıda uzanıb istirahət edən bir cavan oğlan kəmetina başını qalxızıb dedi: keçin gedin, heç zadımız yoxdur, sizin kimi gündə min adam gəlir buradan keçir, hər birisinə bir kasa süd versək, gərək özümüz acımızdan ölək. Bu halda alaçıqdan bir qoca kişi əllərini o yan bu yana sürtə-sürtə çıxdı, baxdım gördüm qocanın gözləri kor olub. Söhbəti dəyişdirib üzümü qocaya tutub dedim:

"Əmi, çoxdanmı sənin gözlərin tutulub?" Cavab verdi ki:

*(Genə olacaq)*

*Ceyranəli*

## HİKMƏTLİ SÖZLƏR

Yer var ki, min manata bir qəpik kimi baxmalı, yer var ki, qəpiyə min manat kimi baxmalı. Məsələn, restoranlarda gözəl xanımlar ilə xərc edəndə, zaqraniçnı aşna saxlayanda, qumara uduzanda, min manatı bir qəpik hesab etmək. Kasıb studentlərə, cəmiyyəti-xeyriyyələrə verəndə qəpiyi min manat gözü ilə görmək.

Asan dövlət qazanmaq üçün dövlətldi yetimə qəyyum olmalı.

İnsanın şərafəti nə elmlədir, nə ədəblə; məhz pul ilədir.

Hər oxuyan Molla Pənah olmaz, amma hər bir minbərə çıxan molla olar.

Dünyada bir qüdrət var, bir hikmət. Qüdrətin müqabilində hikmət söhbəti gərək ortalığa çıxmasın, pəs ülumi-dünyəviyyə kəsb etmək haramdır?

İki itin, iki donuzun, iki övrətin ortasından keçmə.

İstəyirsən hamı səndən qorxub çəkinsin, ya qoçu ol düşəndə bir adam öldür, ya filan idarəsilə əlaqədə ol.

Müsəlman artisti gərək qudurğan ola, xüsusən tragiklik vəzifəsini götürənlər.

*Həkimz nuni-zəğir*

## XIRDA-MIRDA XƏBƏRLƏR

**Bakı** - Bakı, Mərdəkan, Şüvəlan dəmir yolu hazır oldu. Sərnişinlər hər gün rahat və fərağat gəlib getməkdədirlər. Cəmi qırmızısaqqalların rəyi budur ki, dəmir yol xəttini Şüvəlandan dəxi də uzadıb bir xətt "Əliayağı" pirinə və bir xətt də "Pir Həsən" adlı pirə çəksinlər tainki zəvvar üçün ziyarətə gedib-gəlmək çətin olmasın.

**Şirvan** - Hacı Əli Heydər və Hacı Cabbar Salamovlar əlli min manat təzə açılan nicat cəmiyyətinin şöbəsinə ianə ediblər ki, şəhərimizdə qiraətxana və üxüvvət məktəbi açılsın.

**Buxarayi-şərif** – Rəməzan ayını burada iyulun 19-da, Türküstanda 20-də görmüşlər. Orenburq şəhərinin üç məhəlləsində 21 iyulda, qalan yerlərində 22 iyulda görülübdür.

**Şamaxı** - Bu yaxınlarda burada bir malakan piri tapılıbdır. Camaat ixlasi-iradət ilə o pirə hər nə nəzir deyirlərsə qəbul olunur. Bu pirin səfayi-batinindən Bakı "Nicati-Maarif" cəmiyyətinin bir şöbəsi bu günlərdə Şamaxıda açıldı və şərifi-iftitahına Mustafa əfəndi bir atəşin nitq söylədi.

**Lahıc qəsəbəsi** - Burada Molla Hüseynəli dayıoğlu taxtabiti duası yazır. Hər kəsin bu bəladan qurtarmaq arzusu var İrkutski ulitsa nömrə 8-də cənab axunda müraciət etsin.



*Эллектроп Грузинск. Изд. Товарщества Больш. Ванская ул № 21*



Ədirnədən türklər çıxanda



Ədirnəni dübarə alanda

**Adres:** *Tiflis, Davidov küçəsi nömrə 24.*
**Адресь:** *Тифлись, Давидовская, 24.*
**Teleqram üçün:** *Tiflis, "Molla Nəsrəddin".*
**Для телеграмм:** *Тифлись, "Молла Насреддинь".*
***Подписная цена:***
***На годь - 6 руб.***
***6 месяц - 3 р. 50 к.***
***3 месяц - 2 р.***
***1 месяц - 40 к.***
Adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

**Qafqazda və Rusiyada**
**12 aylığı - 6 manat**

"-----------------------" 6 aylığı - 3 manat yarım
"-----------------------" 3 aylığı - 2 manat
"-----------------------" 1 aylığı - 40 qəpik
*Əcnəbi məmləkətlərdə 12 aylığı - 7 manat*
"-----------------------" 6 aylığı - 4 manat

***Tək nüxsəsi idarəmizdə 10 qəpik, özgə şəhərlərdə 12 qəpik.***

CİDDİ

## ANA DİLİ

*(Keçən nömrənin axırı)*

Allah Əlibəy Hüseynzadəyə insaf versin. Kaş o alicənab İstanbulda rahat əyləşib bizim şumbəxt Qafqaza təşrif gətirməyəydi. Ol cənabın elm və kamalına sözümüz yoxdur. Sözümüz ondadır ki, elm və kamalından bizə bir bəhrə vermədi, ancaq dilimizə pozğunluq saldı, təzə dil gətirdi. Ətrafını bir dəstə meymunlar bürüdü və ona təqlid etməkdə bir-birinə macal verməyib böyük hünərlər göstərdilər. Az vaxtın içində Qafqaz türklərinin dili osmanlı sözləri və istilahları ilə doldu: "işbu", "iştə", "şimdi", "şol", "əfəndim", "bakalım", "nasıl" sözləri qəzet sütunlarını doldurdu.

Bu işin nəticəsi bu oldu ki, indi qəzetlərimizin və jurnallarımızın dilini oxuyub başa düşmək olmur. Ana dilini öyrənmək üçün yazılan təlim kitablarımız öylə bir çətin dildə yazılır ki, onların vasitəsilə ana dilini ancaq unutmaq olar. Üç-dörd yüz səhifəli təlimi-qiraət kitablarımızda "ata", "ana", "yaxşı" kimi çox işlənən və əziz sözlər dərman üçün belə axtarılsa tapılmaz. Bizim əqidəmizcə bu müqəllidlik və rəftar - millətə xəyanət etməkdir. Biz bir tərəfdən ilminskilərə, miropiyevlərə, livinskilərə nifrin edib nalayiq sözlər deyirik ki, dilimizi atıb bizi ruslaşdırmaq istəyirlər. Bir tərəfdən də özümüz ana dilinin pozğun hala düşüb unudulmağına çalışırıq. İndiyədək mənəvi tərəqqimizə mane olan illət bir isə, indi iki olur. Bir tərəfdən hürufat qüsuru, digər tərəfdən dil qüsuru əlimizi və ayağımızı bağlayıb qoymayır ki, irəli gedək.

Doğrudan da bir fikir etmək lazımdır. Allah-təala dili insana veribdir ki, onunla insan fikirlərini və hisslərini bəyan etsin. Bu barədə Taleyranın sözü həqq deyil ki, guya dil insana fikrini gizlətmək üçün verilibdir. Bu bir batil qövldür ki, siyasi işlərdə az-çox əhəmiyyəti vardır. Bizim yəqinimizdir ki,

dili dolaşıq şəxsin fikri də dolaşıqdır. İbarəpərdazlıq - fikrin boşluğuna və bir dərəcədə yoxluğuna dəlalət eləyir. Doğru və sələmət fikirli adamların kəlamı həmişə aydın, açıq və düzgün olur. Ancaq sərsərilərin və müxtəlilşüur kəslərin sözləri başsız və binasız olur ki, onları anlamaq qeyri-mümkündür. "Şəlalə"nin 22-ci nömrəsində möhtərəm müəllim M.M. doğru yazır ki, səkkiz yüz ildən bəri türk qövmü yapdığı səltənətlər pozulub xarab olubdur və olmaqdadır. Onun üçün baqi qalan bircə dildir ki, indi onu da türk yazıçıları və türk ədibləri əlindən almaq istəyirlər. Altunqələmin ona yazdığı cavab bizə bir az gülünc gəldi. Hər nə isə bu barədə danışmağı artıq bilirik.

Ancaq təəssüf etməli və bizə ağır gələni budur ki, möhtərəm İsabəy Aşurbəyli külli xərc töküb "Şəlalə" jurnalının təb və intişarı yolunda əlindən gələni əsirgəmir. Vəli, Səbribəyzadə cənabları haqqı olmaya-olmaya kişinin xərcini zaye edir və arzularını puça çıxardır. Jurnalın dilini o qədər çətin edibdir ki, bir kəs onu oxuyub başa düşə bilmir. Əgər "Şəlalə" böylə gözəl şəkildə ki, təb olunur - dilini asan və sadə etsə idi - Qafqaz türklərinə böyük xidmətlər göstərərdi və onları maarif kəsbinə rəğbətləndirərdi. Vəli... indiki halda rəğbət əvəzinə - nifrət və etinasızlıq kəsb etməkdədir.

Millətini sevən, onun mənəvi diriliyinə çalışan, tərəqqisi yolunda əmək sərf edən yazıçılarımızdan, ədiblərimizdən və şairlərimizdən çox-çox təvəqqe edirik ki, dillərini asanlaşdırsınlar, ana dilindən uzaq düşməisnlər, meymunluqdan əl çəksinlər, fikirlərini açıq və sadə dildə yazsınlar, ta ki onların yazdıqlarını oxuyan anlasın, düşünsün və ayılsın. Ancaq bu yolda yazan ilə oxuyanın arasında dostluq, ittifaq və birlik əmələ gələ bilər.

*Firidun Köçərli*

## ƏDƏBİYYAT

Qafqaz dolu sərasər şairdi, maşaallah
Fənnində həpsi şerin, mahirdi, maşaallah

Əşarı zövqbəxşi-xatirdi, maşaallah
Küllən bədiə, şeri, bakirdi, maşaallah
Gizlin deyil həqiqət, zahirdi, maşaallah
Zalım uşağı dersən, Sabirdi, maşaallah.
Bu möhtərəmlər ilə..., islam müftəxirdir
Məlumdur ümumə, hər yerdə müntəşirdir.
Xəsmin həsəddən eyşi, həm qəlbi münkəsirdir
Söylər, yazar bədahə, əşarə müqtədirdir.
Bunlar deyil ki, şair sahirdi, maşaallah
Zalım uşağı dersən Sabirdi, maşaallah.

Nəql eylədi eşitdim, bir danə Hacı oğlan
Kim var imiş iki, üç, novrəs cavan süxəndan
Məsti-şərabi-millət, bihuşi-fikri-övtan
Yekrəy, qövl, məslək, bir dil və bir könül, can
Həp millət ehtiyacın, zakirdi, maşaallah.
Zalım uşağı guya Sabirdi, maşaallah.

Bu vəzndə birər şer yazsınlar istəyirlər
Yürümək başarmırkan dazsnlar istəyirlər
Şerə bununla bir gor qazsınlar istəyirlər
İnsaf, ədəb izindən azsınlar istəyirlər
Üç, dördü birləşibdir, əlbirdi, maşaallah
Zalım uşağı dersən, Sabirdi, maşaallah.

Gündən-günə təşair ərbabı çox çoxaldı
Xamə yerinə bunlar, cümlə ələ ox aldı
Şair olan azaldı hətta belə yoxaldı
Xürrəmlərin aşından millət yedi toxaldı
Bu iqtidarı şair, batırdı maşaallah
Əşarı zövqbəxşi-xatirdi maşaallah.

Qafqazlılar edirdi, pul, mal sirqət əvvəl
Qızlar, qadınlara həm, tək-tək atırdılar əl
Oğlan qaçırtmağa bu, oldu sora mübəddəl
Var indi də növicad, bir oğurluq mükəmməl
Bu işdə ixtirai-axırdı maşallah
Hər peşədə müsəlman mahirdi maşaallah.

Bu ixtirai-axər, əşar oğurlamaqdır
"İqbal" işıqçılara yazmaq və yollamaqdır
Ən-ən böyük cəsarət, ənzarı bağlamaqdır
Minlərlə qareini, ürfanı tovlamaqdır
Böylə hər işdə nazir, basirdi, maşaallah.
Mədhində bunların dil qasirdi, maşaallah.

Bu işləri görəndən sonra, bütün matam mən
Əl çəkmişəm özümdən, az qalmışam batam mən
Qət etmişəm ki, dəxi, şairliyi atam mən
Dəftər, qələm, kitabı, toplaşdırıb satam mən,
Çünki süqutumuz pək zahirdi, maşaallah
Şairlərin vücudu, hazırdı, maşaallah

Qorxum budur yorulsun, təbim atı yarışda
Keçsin qabağa məndən, yoldaşlar on qarış da
Onlara mən müqabil, olmam bu qat-qarışda
Olmaz deyildir adət, xudbinlər barışda




*Rəiyyətlərin əzabı*




*Onların əllərinin əməyi.*
*– Al bu da yüz manat, rəiyyətlərin canı çıxsın bu xərclərin hamısını onlardan döyə-döyə alacağam.*




İran nişanlarının səyyar vıstavkası.

Müştəri
مشترى

Xozeyin
خوزئين

Prikazçiklər
پريقازچيقلر

Bu dükanın xozeyni kimdir?
Mənəm başına dönüm, nə qulluq?

Əfkarı onların çun, sairdi, maşaallah.
Şəxsiyyətə, dolaba, dairdi, maşaallah.

Heyfa, deyil müsaid, vəxtü zəmanü əyyam
Açmağa qoymayır göz ənduh, dərd, alam
Kim nuş edib əlindən, yarın iki dolu cam
Sinəmdəki məramı, ta eyliyəydim əfham
Bəzi cavanlara kim meydana çıxdılar xam
Fəhmə fəqət bu canlar, qadirdi, maşaallah.
Biqeydi-qəm həm şən, şatırdı, maşaallah.
Yazmaqda şer əbyat, gəzmək səma, səməkdə
Şüərayi-binəvanın, şerin bəyənməməkdə.

Sirqətdə mətləin pək, mahirdi, maşaallah
Hər kəs buna desin ki,
Şairdi, maşaallah
Əhsən və barəkallah.

*Keyfsiz*

**HİKMƏTLİ SÖZLƏR**

Dünyada xoşbəxt yaşamaq üçün cavanlıqda əfsər olub, qocalıqda hacı olmalı.

Hər kəs güman etməsin ki, heç kəs öz atasının oğlu deyil, hamı öz atasının oğludur.

Övrəti ağac ilə döymək aqil işi deyil. Sümüyü sınsa gərək üç övrətin xərcini sınıqçıya verəsən.

Gücün çatmayan övrəti alma.

*Həkim Nuni-Səğir*

**ELAN**

Bununla yazıb Qafqaz müsəlmanlarına məlum edirik ki, hər kəsə qız və kəbinli arvad

## FELYETON

### MARALLARIM

***(Acından təbib)***

*Keçən nömrənin axırı*

Bala, iki aydan bir az artıqdır. Çılpaq tədbirli olar. Xüsusən də ki, qarnında tərs toy çalına.

O saat yoldaşımı çağırdım, dedim: "Ay Kərbəlayı Məhəmməd, sən həkimliyini burada da işlətməyib harada işlədəcəksən: Bir gəl bu kişinin gözünə bax. Kərbəlayi Məhəmməd gülə-gülə atdan düşüb gəldi, qocanı qabağında oturdub başladı mahir həkimlərtək onun gözünün içinə baxmağa. Cavan oğlan yerindən sıçrayıb üzünü Kərbəlayi Məhəmmədə tutub soruşdu: "A sənin başına dönüm, sən həkimsən?" Kərbəlayıdan qabaq mən cavab verdim ki, bəli bu adam göz həkimidir, belə həkim heç İranda da tapılmaz. Oğlan bizdən kəmetinalığına üzr istəyib girdi alaçığa, sonra alaçıqdan bir üzüörtülü övrət çıxıb gəlib çöldə ocaq qalayıb, bir qara aftafanı qoydu ocağa. Məlum oldu bizə çay tədarükü görünür. Köçə göz həkimi gəlməyini eşidib köç əhli hamısı cəm oldu bizim başımıza. Kərbəlayi Məhəmməd diqqət ilə qocanın gözünə baxandan sonra dedi: inşallah tezliklə gözləri açılır. Amma gərək bir qədər qara qoyun quyruğu olsun. Cavan oğlan o saat çobanı çağırıb buyurdu ki, gedib bir qara erkək kəssin. Çoban getdi. Kərbəlayi Məhəmməd üzünü mənə tutub dedi: "Sən də get mən dediyim ələfiyyatı götür gəl". Dedim: "Baş üstə, sənə nə ələfiyyat lazımdır buyur gedim gətirim." Dedi: get gətir bir qədər giyahi-mahi, bir qədər bərgi-dirəxtani-səbz, bir qədər də türünci-ğəbğəb. Başüstə deyib yüyürdüm səhraya əlimə keçən ələfiyyatdan yığıb gətirdim.

Kərbəlayi Məhəmməd qabağıma bir həvəng qoyub, dedi bu ələfiyyatı quyruq ilə bir yerdə həl döyərsən. Bir qədər də xurcundan saqqız çıxardıb, atdı həvəngin içinə. Həvəngin içindəkilər dürüst əziləndən sonra, Kərbəlayı bir bez üstə yaxıb yapışdırdı qocanın başına. Burada bizə əvvəl çay verdilər, üstündən qara qoyunun kababından iləlhülqum yeyib, bir parça da qoyunun ətindən yol azuqəsi götürüb düzəldik yola.

Bu vaxtdan iki ay yarım keçdi. Kürdlərdə alış-verişimizi qurtarıb qayıdırdıq, yolumuz genə həman yerdən düşdü. Yaxınlaşanda gördük yolun kənarında bir sürü qoyun otlayır. Qoyunların yanında bir qoca kişi əliağaclı durub, biz müalicə etdiyimiz kişiyə oxşayır. Biz çox təəccüb etdik onun gözlərinin açılmağına. Kərbəlayı Məhəmməd atın irəli sürüb dedi:

*(Genə olacaq)*

*Ceyranəli*

götürüb qaçmaq və qızın nişanlısı olsa onu və ya arvadın ərini öldürmək də lazım olsa özü heç zəhmət çəkməyib, durmayıb yazsın Bakıdan bu aşağıdakı adres ilə bu dörd nəfəri istəsin. Bunların yaxşı tapançaları və hər bir alati-hərbiyyələri vardır. Bunlar hər yerə getməyə də razıdırlar. Adları bu qəprar iledir: dəstəbaşı Bəy Hüseyn, Fars Sadıq, Uzun Kazım və faytonçu Tayqulaq Məmmədqulu.

*Adres: Bakı, Quba meydanı, qarsatan dükan.*

## DƏYƏNƏK

*Misyonerlər çalışır cəbrlə abxaz* qövmü*
*Eləsinlər hamısı dini-məsihani qəbul*
*Qılmasınlar dəxi qanuni-şəriətlə namaz*
*Etməsinlər ölünü dəfn be ayini-Rəsul*
*Deməyirlərmi bizim müftiyə bu məsələni?*
*Elə tədbir eliyə mat ola bilmərrə üqul*
*Ya deyirlərsə də əlbəttə eşitmir qulağı*
*Çünki din məsələsi şimdi deyildir məmul.*

*Cüvəllağıbəy*

## TAPMACA

Birisinin ayda cəmi-cümlətanı yüz manat məvacibi ola, həman adam nə cür ayda otuz manat ev kirayəsi verib bir fayton dörd at sürücüsü ilə və dörd arvad mürəffəülhal dolandırıb hər gecədə klubda iki yüz manat qumara pul uduza bilər və hər ildə atasını bir dəfə Kərbəlaya və bir dəfə Xorasana göndərər?

Hər kəs bu tapmacanı tapsa onu Ağdamda nayibi-konsul təyin edəcəklər.

## İRƏVAN ELEKTRİKİ

*Asudə bizi nə qədr edərsə*
*Özgə çıxaran əzim elektir*
*Əxlaqımızı pozur o qədri*
*Bu mollanüma bizim elektir.*

*Müridülməşayix*

* Suxum okruqu daxilində 24 para kəndə qədər əhaliyi-islamiyyədir.

*Müdir və baş mühərrirlər:*
*Cəlil Məmmədquluzadə, Əliqulu Nəcəfov*

## ELANLAR

İdarəmizdə "Molla Nəsrəddin" məcmuəsinin 3-cü, 4-cü, 5-ci, 6-cı illiyinin yaxşı cildlənmiş kitabları mövcuddur. Qiyməti idarədə 6 manat, sair şəhərlərdə poçta xərcilə 7 manatdır və həmçinin Molla Nəsrəddinin əsərləri "Usta Zeynal", "İranda hürriyyət", "Qurbanəlibəy": qiymətləri 20 qəpik, yaxud 3 dənə 7 qəpiklik markadır. "Bizə hansı elmlər lazımdır?" kitabı da var, qiyməti 15 qəpik.

Və genə "Rəhm çeşməsi" və "Poça qutusu" qiymətləri 5 qəpik. Hər kəs talib olsa xəbər versin naloj təriqilə hər bir məmləkətə göndərə bilərik.



*Электроп. Грузинск. Изд. Товарищества Больш. Ванкская ул.№21*




*Bu gün bankda yüz manat surokum var, nə qədər çalışıram düzəldə bilmirəm, protestə gedib lap rüsvay olacağam.*

# ملا نصرالدين

№24 Qiyməti 12 qəpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 24


*Təbrizdə sahibüləmrdə olan möcüzün birillik yubileyi münasibətilə.*



*Yox, yox, elə şey olmaz, sən bu heyvanı çox incidibsən sənin zülmündən qaçıb gəlib girib bəstə, onu geri qaytarmaq günahdır.*

О-ш-

**Adres:** *Tiflis, Davidov küçəsi nömrə 24.*
**Адресь:** *Тифлись, Давидовская, 24.*
**Teleqram üçün:** *Tiflis, "Molla Nəsrəddin".*
**Для телеграмм:** *Тифлись, "Молла Насреддинь".*
***Подписная цена:***
***На годь - 6 руб.***
***6 месяц - 3 р. 50 к.***
***3 месяц - 2 р.***
***1 месяц - 40 к.***
Adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

**Qafqazda və Rusiyada**
**12 aylığı - 6 manat**

"----------------------" 6 aylığı - 3 manat yarım
"----------------------" 3 aylığı - 2 manat
"----------------------" 1 aylığı - 40 qəpik
*Əcnəbi məmləkətlərdə 12 aylığı - 7 manat*
"----------------------" 6 aylığı - 4 manat

***Tək nüxsəsi idarəmizdə 10 qəpik, özgə şəhərlərdə 12 qəpik.***

# Ədəbiyyat

## FİZULİNİ BEŞLƏTMƏ

Yoxdur aləmdə dəxi qüssəvü dərdi-mühənnim
Vardı hər yerdə mənim bollu suyum, bollu dənim
Məni min fikrə salan bu gödənimdir gödənim
Pənbeyi-daği-cünun içrə nihandır bədənim
Diri olduqca libasım budur, ölsəm kəfənim.

Aldadıb xəlqi bütün kəndimə qıldım mayil
Ərşeyi-minbərə çıxcaq sölərəm latayil
Siğəsiz gün keçirib olmaram əsla qafil
Canı canan diləmiş, verməmək olmaz, ey dil
Nə niza eyləyəlim ol nə sənindir, nə mənim.

Hara getdimsə mənə göstərilən hörmətdir
Millətim çünki həqiqtədə gözəl millətdir.
Molla olmaq belə bir qövmə böyük nemətdir
Tuği-zənciri-cünun daireyi-dövlətdir,
Nə rəva kim məni ondan çıxara zəfi-tənim.

Hansı bir şəhrə və ya kəndə ki düşdü güzərim
Olacaq gündə kababım, bilərəm simuzərim
Olmayıbdır əliboş övdət edəm bir səfərim
Eşq sərgəştəsiyəm seyli-sirişk içrə yerim
Bir hübabəm ki həvadən doludur pirəhənim.

*Cüvvəllağıbəy*

## UZUN BİR DANIŞIQ

Ermənilərin məşhur yazıçısı R-nın oğlu dünən gəlmişdi idarəmizə. Çox söhbətdən və başağrısından sonra anlaşıldı ki, bu adam on yeddi ildi Londonda qəzet verir və bu tərəflərə gəlməkdən qəsdi Məşriq məsələsini öyrənməkdir. Tiflisə

gəldikdə eşidib ki, burada "Molla Nəsrəddin" adlı bir türk məcmuəsi verilir. Sevinə-sevinə gəlmişdi ki, bir şey bizdən öyrənib gedib yazsın, bikar ingilislər oxusunlar. Jurnalımızın pişrəftinə, yazılarına və müştərilərinə dair bir para suallar elədi. Doğrusu bəzisindən qan qoxusu gəlirdi. İstədim bir təhər eləyəm vaz keçsin, başa gəlmədi. Labüd qalıb bu cavabları verdim: əvvəla məcmuəmizin işi çox yaxşıdır. Bu il səkkizinci ildir nəşr olunur. İlbəil tərəqqi və rövnəq görsənir. Müştərilərimiz getdikcə artır. Başladım bir-bir şəhərlərin və məmləkətlərin adını saymağa, haralarda ki, bizim jurnalı alıb oxuyurlar. Məsələn: qərbi Çində, Türküstanda, Volqa qıraqlarında, Finlandiyada, Lehistanda, Osmanlıda, İranda, Qafqazda və sair müsəlman şəhərlərində. Mən bu adları saydıqca cənab R. təəccüb eləyirdi. Axırda dedi ki, bu qədər yerlərə ki, sizin jurnalınız dağılır o surətdə gərək sizin Parijdə, Londonda verilən "Peti-Parizyen" və "Taymıs" qəzetlərindən çox müştəriniz ola! Bu qəzetlərin hər birisinin milyon yarımdan artıq müştəriləri var. Dedim səhv eləyirsiniz, o qəzetləri oxuyanlar firənglər və ingilislər kimi bikar adamlardır. Parijdə bir qəzet satan uşaq çağırsa ki, filan yerdə ya şəhərin filan küçəsində bir adam öldürüblər o saat iki yüz adam tökülüb ondan qəzet alıb oxuyacaqdır ki, görsünlər niyə və nə cür olur ki, adamı vurub öldürürlər.

Amma bizim İrəvanda, Bakıda gündə iki nəfər, üç nəfər öldürməsələr camaat təəccüb eylər və danışmağa söhbət tapmazlar, qəzet və jurnal oxumağa da əsla vaxtları olmaz. Sizin məmləkətdə bir adam gündə neçə cür qəzet alub oxuyar, amma bizim şəhərlərdə min beş yüz adam bir qəzet və ya məcmuə alıb şərik oxuyarlar. Məsələn: Gəncə kimi iyirmi iki min beş yüz müsəlman olan bir şəhərdə on beş nömrə "Molla Nəsrəddin" satılır, Bakıda yüz əlli min müsəlman var, düz yüz əlli nüsxə gedir. Şuşa qalasında otuz min camaatdan üç nəfəri jurnaılmızı alıb oxuyur. Deməli hər on min adama bir nömrə düşür. Gördüm inanmayacaq, abunə dəftərini açdım qabağına. Bir az o yan-bu yana vərəqləyəndən sonra soruşdu ki, bəs bu nisyə sözləri nədir ki, hər adresin yanında qeyd etmisiniz? Dedim ki, nisyə yəni o adamlara jurnalımızı kredit göndəririk. Gördüm dediklərim dostuma qəribə gəlir. Dedim nəinki nüsyə müştərimiz var, biz hətta şəhərlərə müftə göndəririk satmağa. Bu sözləri deməyimə özüm də peşiman oldum, dostumun gözü bərəli qaldı. Sonra gülümsünüb dedi ki, Lağlağı qardaş, indi fənninizi duymuşam, burada yəqin bir bijlik var!

*(Genə olacaq)*

*Lağlağı*

## ƏŞ'AR

*Çalışma elm üçün divanə bir bunca gecə-gündüz*
*İpin övrətlərin çox da boşaldıb verme artıq üz.*

*Qalıb az haqların alsınlar övrətlər olub azad*
*Amandır noxtasın çək, başını bağla, boğazın üz!*

*Həzər qıl məktəbə vermə ki, öyrənsin qızın yazı*
*Üzü açıq gəzib naməhrəm ilə oynasın göz-göz.*

*Deyil oğlan ki, bunlar qurtarıb kurs advokat olsun*
*Vəkillik eyləyib sudlarda alsın fayidə yüz-yüz.*

*Qızın var vergilən bir varlıya, ya molla, ya seyyidə*
*Kefincə, ömrün olduqca yeyib-iç, süd gölündə üz!*

*Məkatib qız uşağı çadra yox, çəkməli donlu?!*
*Bu da oldu müsəlmanlıq, bu da ya oldu şər'ən düz?!*

*Ola doqquz yaşında qız, gərək ya ərdə, ya gorda,*
*Nəinki küçədə, işkolda örtüksüz boyun, baş, üz?*

*Müsəlmanlıq qalıb gör bir nə hala kim müsəlmanlar*
*Kitabət öyrədirlər qızlara ismət gedir əl-üz*

*Mənim tək yazmağımla bitməz iş sən də çalış, Molla!*
*Mühərrir! Yaz! Müsəhhih bax bir az artır, mürəttib düz!*

*Qabağın kəs bunun ay mömin, ay dindar, ay molla!*
*Gedir qeyrət, itir ismət, batır hörmət budur son söz*

*Tfu dünya sənə lənət, necə gör azdı məxluqat*
*Ocağında bu gün dindarlığın baqi deyil bir köz!*

*Keyfsiz*




*Vələdizzina sənmi deyirsən ki, Tolstoy bizim müctəhidlərimizdən artıq bilirdi və camata onlardan artıq fayda veribdir? Gərək sənin dilini kəsək.*

**Bir para mömin müsəlman qardaşlar**

بر پاره مؤمن مسلمان قارداشلار

***Gecə gəzməkdə.*** ***Gündüz camaat nəzərində.***

50 yaşında ۵۰ یاشنده

48 yaşında

گیتمرم آدامه قارا من یوق یاشنده ۴۸

45 yaşında

۴۵ یاشنده

آز سزك اوچكزدن بريكزى عباسقلى تارويردى اوغلى ئەوه ايستيور اوزى سلامت دينج كسب كار آد

*– A qız, sizin üçünüzdən birinizi Abasqulu Tarverdi oğlu ərə istəyir. Özü səlamət, dinc, kəsbkar adamdır. Allaha şükür bir parça da çörəyi var.*

*– Yox, mənim nişanlım ac olsun, bəy olsun.*

*– Yox, mən əfsərə gedəcəyəm.*

*– Yox, mən qara adama getmərəm.*

*İranda, Qafqazda və həmı müsəlman aləmində*

ايرانده قافقازده و هامى مسلمان عالمنده

*Təzə gəlin*

تازه كلين

*Qardaş*

قارداشى

## QAFQAZ XƏBƏRLƏRİ

Dərbənd – Qurban bayramı yaxınlaşdığına görə bir komissiya təşkil olunub ki, bu il yığılan qurban dərilərinin pulundan bir ticarət, bir sənət məktəbi, genə bir qiraətxana açsınlar.

İrəvan – Bu il indiyə kimi görsənməyən əmniyyət və təmizlik şəhərdə bərpadır. Küçələrin palçığı dizdən yuxarı çıxmır və mollalarımızın vəz və nəsihətlərinin bərəkətindən müsəlman qardaşlar həftədə yeddi adamdan artıq öldürməyirlər.

Naxçıvan. – Dövlət dumasının üzvü Papacanov şəhərimizi ziyarət eləyib erməni-müsəlman camaatının ziraət və progimnaziya məktəblərinin açılmağına qoyduqları zəhmətdən və şəhərə su çıxartmaqdan ötrü təşkil olunan heyətin elədiyi iqdamatdan yana şəhərin böyüklərinə razıçılıq izhar elədi.

Naxçıvan – Buranın adlı tacirlərindən birisi çoxdandı ovçuluq məşqinə düşüb. Şikar eləyəndə sona və durnaya etina eləməyib maral və ceyran ovlayır.

Bakı - Məşhur yazıçımız Nəcəfbəy Vəzirovun qırxillik yubileyinə şiddətli surətdə hazırlaşırlar. Eşitdiyimizə görə hörmətli yazıçımızın adına bir heykəl yapdırıb və müsəlman müəlliməsi yetirməkdən ötrü bir arvad darülmüəllimini açmaq istəyirlər.

Gəncə - Təzə bir cəmiyyət təşkil olundu ki, Qafqazın hər bir şəhərindən bu il qurban dərilərini yığıb satandan sonra hasil olan puldan gələcəkdə açılacaq mədrəseyi-ruhaniyyədən ötrü bir imarət tiksinlər ki, daha Tiflis müsəlmanları və idareyi-ruhaniyyə əzaları biryolluq zəhmətdən xilas olub bu məsələdən ötrü yığılan pulları müstəhəq bir yerinə məsrəf eləsinlər.

## ŞƏRM

*Gələcək hey bizi dartır irəli*
*Bilgiyə, fənnə tərəf gəlməyiriz.*
*Yürüyür hər kəs ona, biz də geri*
*Baxaraq qonşuya şərm etməyiriz.*
*Xəlq keçdi bizi fərsəx-fərsəx*
*Biz ayaq, əl belə tərpətməyiriz.*

## FELYETON

## MARALLARIM

***(Acından təbib)***

*Keçən nömrənin axırı*

"Əmi, səlam əleyküm, şükür olsun Allaha gözlərin açılıbdır". Kişi başını qalxızıb xəbər aldı ki, bala, kimsən? Dedi: "Mən sənin gözünə müalicə edən həkiməm". Kişiyə elə bil dünyanı verdilər. Əllərini qovzayıb dedi:

- Atam sənə qurban, ay həkim! Anam sənə qurban, ay həkim! Nə yaxşı mənim əlimə düşdün. Mən gecə-gündüz arzu edirdim ki, bircə gəlib buraya çıxasan, sənin xəcalətindən dürüst çıxım. Buyurun gedək evə.

Kərbəlayi Məhəmməd istədi getməsin, qoca əl çəkməyib apardı evinə. O günü lazımınca qonaq etdilər. Bir yaxşı kök qoyun bağışladılar. Özümüzü də gecə saxladılar.

Axşam camaat başımıza cəm oldu, hərə bir növ ilə Kərbəlayi Məhəmmədin həkimliyini tərif edirdi. Kərbəlayi də özünü çəkib əyləşib, İranda padşahın anasının gözlərinə müalicə etdiyindən danışırdı. O dediyini mən də təsdiq edirdim. Bunu da ərz etməliyəm ki, nə mənim, nə Kərbəlayi Məhəmmədin indiyədək ayağımız İran torpağına düşməyib. Çox söhbətdən sonra kişinin oğlu üzünü Kərbəlayi Məhəmmədə tutub dedi:

- Həkim, Allah sənin atana rəhmət eləsin, səni bu camaata çox görməsin. Sən ki mənim atamın gözlərini sağaltdın, amma bircə dərdimiz var. Atamın başına yapışdırdığın dərman axı qopmayır. Biz, kişinin papağını götürəndə gördük, saqqız layiqincə suvanıb onun başına və tüklər bezi deşib çıxıblar çölə.

Kərbəlayi isti su istəyib zamatı islatdı. Saqqız isti sudan yumşalıb daha da möhkəm yapışdı başına. Gördük ki, heç əlacı yoxdur, kişinin başından qopmayacaq. Kərbəlayi dedi ki, bu dərmanın başda qalmağının əziyyəti yoxdur. Yaxşı olar ki, elə həmişəlik onun başında qalsın.

*Ceyranəli*



### XIRIM-XIRDA XƏBƏRLƏR

Təbriz - Sahibüləmr məqbərəsində olan möcüzün birillik yubileyi münasibətilə əlahəzrət Səmədxan hökm edibdir ki, şəhər başdan-başa çırağan olsun. Camaat artıq dərəcədə şaddırlar. Gecə Topxana meydanında mücavirbaşı yubileyə dair nitq irad edəcəkdir. Təbrizdə keçən günlərdə olan erməni əlifbasının 1500 illik yubileyində ki buranın müsəlmanları təbrik etmişdilər, əvəzində İranın erməniləri dəxi möcüz yubileyinə hər tərəfdən təbrik teleqrafı çəkirlər.

Marağa - Burada Səmədxanın dayısı Ağa Büzürg (bu vücudi-mübarəkin körpə vaxtında qundağını məlaikələr ərşə aparmağına bütün İran camaatı qaildirlər) camaatı yığıb bu məzmunda yubileyə dair xitabə oxudu. Camaat, bizim bu dini bayramımız ki, biz şiələrin mayeyi-iftixarı və səadəti olsa bəcadır, deyil məgər Hacı Səmədxanın ədalətinin bərəkətindən. O cənab Azərbaycana hakim olandan neçə-neçə böylə möcizələr və kəramətlər olubdur. İki il qabaq Xoy şəhərində də bir dənə dəvə Xoy məqbərəsində bəstə girmişdi. Camaat o heyvanın təbərrük üçün tüklərini o qədər yoldular ki, o heyvani-bizəban çıxıb məqbərədən dərbədərə qaçdı. Səməd xanın ədalətindən bu kifayət edər ki, keçən ay camaat azıb genə istəyirdilər məclisə vəkil intixab etsinlər. Bir günün içində bu cür xilafi-şər' əmələ mürtəkib olanlara cəza verildi və seçki məsələsi bütün-bütünə ləğv edildi. Camaat gurultulu əl çalmaq ilə Ağa Büzürgü alqışladılar.

### DƏYƏNƏK

*("Zaqafqaziya" nömrə 225)*

Mir Rovşən zəmiri-xoştəqrir
Elmü fəzli kəmali aləmgir

Dərs oxutmaq məqalə yazmaqda
Ona Tiflisdə yoxdu mislü nəzir

"Molla Nəsrəddin"i tapıb oxuyub
Xoşuna gəlməyib olub dilgir

Keçib üstündən on-on beş gün
Olunub gərçi müxtəsər təxir
Eyləyib eybini genə tənqid.
Çün görüb çoxdu mollada təqsir

Şəkini eyləsin tarı abad
Ki yetirmiş münəqqidani-şəhir

Həm də hifz eyləsin Əfəndiyevi
Ta edə hər qüsurumu təhrir

Elə bir fazili-xirədməndi
Mən həqiqətdə eylərəm təqdir.

*Cüvəllağıbəy*

### TOQQUŞMA

*Bizə göydən edilir gündə nida*
*Çağırır birliyə icmaə zaman*
*Oxunur bir quyuda sanki əzan*
*Onu bu millət eşitmir, əbədə.*

*Müdir və baş mühərrirlər:*
*Cəlil Məmmədquluzadə, Əliqulu Nəcəfov*



*Электроп. Грузинск. Изд. Товарищества Больш. Ванкская ул № 21*




Dur cəhənnəm ol ikinci klasdan çıx, sənin yerin əvvəlinci klasdır.
Şagird - Cənab müəllim, axı mən bu il imtahan verib keçmişəm və bir aydır da ikincidə oxuyuram.




Ya gedək and iç, ya bu saat səndən döyə-döyə pulumu alacağam.

ملا نصر الدين

№25 Qiyməti 12 qəpik. МОЛЛА НАСРЕДДИНЪ Цена 12 k. № 25



**Adres:** *Tiflis, Davidov küçəsi nömrə 24.*
**Адресъ:** *Тифлисъ, Давидовская, 24.*
**Teleqram üçün:** *Tiflis, "Molla Nəsrəddin".*
**Для телеграммъ:** *Тифлисъ, "Молла Насреддинъ".*
***Подписная цена:***
***На годъ - 6 руб.***
***6 месяц - 3 р. 50 к.***
***3 месяц - 2 р.***
***1 месяц - 40 к.***
Adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

**Qafqazda və Rusiyada**
**12 aylığı - 6 manat**

"-----------------------" 6 aylığı - 3 manat yarım
"-----------------------" 3 aylığı - 2 manat
"-----------------------" 1 aylığı - 40 qəpik
*Əcnəbi məmləkətlərdə 12 aylığı - 7 manat*
"-----------------------" 6 aylığı - 4 manat

***Tək nüxsəsi idarəmizdə 10 qəpik, özgə şəhərlərdə 12 qəpik.***

## ŞƏRİƏTDƏ ŞƏRM YOXDUR

Mən uşaq vaxtımda hərdənbir məscidə gedirdim və çox vaxtlar olardı görərdim ki, (torpağı sanar yaşayasınız) bizim Hacı Axund minbərin üst pilləsində əyləşib ayağında ağ tuman, bağı eşikdə. Biz uşaqlar küçədə danışdığımız sözlərdən danışır və istibradan bəhs açıb istibranı nə cür etməli və nə növ mövzei-mö'tadı sığarlamalı, hamısının təhrini eynilə camaata göstərir və hamısı gözləri bərələ-bərələ qalıblar.

Mən, həqiqət bu işlərə və bu sözlərə çox utanırdım və qalardım məəttəl tainki axundu bir gün girləyib soruşdum ki, cənab axund! Niyə gərək peyğəmbər minbərində sizin kimi böyük vücudlar arvad-uşağı mülahizə eləməyib belə sözlər danışasınız?!! Axund bir altdan yuxarı mənim üzümə baxdı dedi: oğlum, sən uşaqsan, qanmazsan, şəriətdə şərm yoxdur. Gərək bu cür məsələlər camaata andırıla və əvam bu məsələləri bilə. Mən daha bir kəlimə də olsun danışmadım, özüm bu mətləbi ürəyimdə vuruşdurdum, tainki axırda mənə məlum oldu ki, doğrudan da (kəlamül hacı Axund Hacı Axundul-kəlam) nəinki şəriətdə şərm yoxdur, bəlkə şəriət adı ilə meydana girənlərdə də əbədən şərm və həya yoxdur.

Mən buradan bir müxtəsər haşiyə çıxacağam. Amma ay oxucular, siz Kamil paşanın canı mənim bu sualıma insaf ilə cavab verin!.. Məsələn, belə götürək ki, indi bir əcəli tamam olmuş Allahdan qorxmadı, canına yazığı gəlmədi, durdu düşdü yola. Günə bir mənzil teyyi-mənazil bir baş getdi Bakıya Mir Məhəmməd Kərim ağanın hüzuruna və ağadan bircə bu sözü soruşdu ki, atam-anam sənə fəda olsun, aya imam divarın dalını bilər, ya yox?

Onda o əllameyi-fəhhamə nə cavab verəcək? Və əgər soruşan adam mütərəddid qalsa desə ki, ağam, dilim qurusun, mən eşitmişəm deyiblər bilməz, onda necə olacaq? Söz yox ki, ağa müridlərini çağırıb o şəxsə qədər seyxəki saldıracaq ki boynu təbrizli boynuna oxşasın. Amma di gəl o adamda bir müxtəsər cürət ola, özün itirməyə, ölümdən qorxmaya, çaparaq qaçıb kitabçı dükanından bir cild (Əzrai-qüreyş) kitabı ala gətirib açа ağanın qabağına deyə oxu tərcümə elədiyin mətləbləri. Aya onda ağa baxıb görmiyəcəkdir ki, onun yazdığından nəinki bu çıxır ki, imam divarın dalını bilməyirdi, bəlkə öz əyalın, övladın və bacısını da tanımayırdı?!!

Şəriətdə şərm yoxdur və şəriətin şərmi olmamağına şiə sünni qaildir. Çünki şəriətdə şərm olsaydı Təbriz müctəhidinin oğlu hər iki ayda bir bəhanə gətirib gəlib Tiflisə gecə gündüz ömrünü naməhrəmlərlə keçirdib Təbrizdə camaatın boynunun kökünə döydürüb vadar etdirməzdi ki, ona höccətülislam vəlmüslimin desinlər.

Genə deyirəm vallah, billah nə şəriətdə və nə şəriətin əhlində şərm yoxdur. Çünki inşallah beş on gün keçsə məhərrəm ayı daxil olsa görəcəksiniz ki, şəriət adı ilə nə həngamələr meydana çıxır və necə hər məmləkətin damdələn, cibkəsən, adam öldürən tülüngüləri bədənlərinə xəncər taxıb, qıfıl keçirdirlər və necə mərsiyəxanlar kefli-kefli minbərə çıxıb gözəl övrət və gözəl uşağın havası başlarına vurub övcə qalxıb şuri-şəhnaz oxuyurlar və avam, yazıq, biçarə camaat körpə uşaq kimi gözlərinin heliyini axıdırlar və axırda bir ildə zəhmət ilə qazandıqları pulları ağlı-qaralı tökürlər Mirzə Ələkbər mərsiyəxanın ətəyinə…

Şəriətdə şərm olsaydı Naxçıvanda Mir Pırtdaşıq bir həya elərdi və özünü peyğəmbərə isnad verə-verə elə hərəkət gətirməzdi ki, peyğəmbər ondan həya eləsin. Qafqazda Molla İsmayıl, Qubada Molla Hacıbaba, Lənkəranda Molla Qəvam, Qalada Ağa Əbdürrəhim, Gəncədə Ağa Mir Bağır, Şamaxıda Mustafa əfəndi, Şəkidə Molla filan şəriətdən həya eylərdilər və bu yazıq məxluqatın yaxasından əl çəkərdilər. Şəriətdə şərm olsaydı heç olmasa Göyçay qazısının yanına ki birisi bir qız götürüb qaçmışdı ki, onun kəbinini kəssin, o qızın qohum əqrəbasına xəbər göndərərdi ki, gəlib qızlarına sahib dursunlar, nəinki qızı oğlanın əlindən bir bəhanə ilə alıb özünə şər'i hərəm eylərdi.

Bu məsələlər və bu işlər aşkarən göstərir ki, şəriətdə şərm yoxdur, şəriət əhli gərək nə Allahdan, nə peyğəmbərdən və nə camaatdan utanmasın, nə bilirsə eləyib və nə ağzına gəlirsə danışsın.

İndi ki, mətləb açıldı və hamınız bildiniz ki, şəriətdə şərm yoxdur, qoyun şəriət əhli nə bilirlərsə canasınar eləsin, əbədən nəfəsinizi çəkməyin və kişilərin burnundan tökməyin!

Öləndə virdiz ola la ilahə illəllah
Əgər əliz götürüb söyləsəz ki, ya Allah
Ya Allah ya Allah…

*Sarsaqqulubəy*

## ƏŞ'AR

*Dirilmişəm genə gəlib qanadlarım dübarədən*
*Curuldaram zərifraq həzarədən məzarədən.*

*Üyubun eylərəm əyan bu xandı, bəydi qanmaram*
*Axundü mirzə şeyx ola yazıb işin utanmaram*
*Lotu-potu, ağa-mağa, tərəf-mərəf tutanmaram*
*Qərəz-mərəz nəzərdə yox, o barədən bu barədən.*

*Curultumun kəsildiyin görən kimi elektrik*
*Hicabdən döyəşdiyir o müftə yağlanan hirik*
*Vurur, basır, asır-kəsir Qəmərli ilə müştərək*
*Təfənnün ilə yelliyir ibarədən mibarədən.*

*Əlində "Molla Nəsrəddin" düşür bazara Dərvişof*
*Deyir ki, almayın bunu yazır bizə bu çox küluf*
*Hədis, ayələr deyir misal üçün uluf, uluf*
*Keçib şərarəti onun şümarədən, mümarədən.*

*Qarıldayır qəmərlili cənab şeyx Mədəli*
*Söyür qəzet yazanları uzun laşərdə, kürdili*

Верните́сь домой или сейчасъ застрелю! Не женѣ судить о дѣйствіяхъ мужа!!




***Bu saat qayıdın evə yoxsa atdım! Gözünüzü çıxardıb beşinci arvadı da alacağam!!!***



*Zəmanəmizin pəhləvanları. Герои нашего времени.*

*Çığır-bağır, haray-huray görən deyir olub dəli.*
*Deyir, yorur: yalan-palan düşür hər hansı barədən,*

*Əlində bir qırıx qələm papaqçı mübtəla çıxır*
*Papaxdı sanki şer də yazıb dükanı doldurur*
*Doşabçı seyyidin əcəb bu binəva dəmin tutur*
*Yazanda nəzmü nəsrlər tamaradan mamaradan.*

*Beş on itilget adlılar bir oğlanın inadına*
*Hərə alıb ələ ağac qulamparalıq adına*
*Çıxırlar hər gecə bağa çocuqların cəhadına*
*Ağır bir ordu cəm olub o karədən bu karədən.*

*Qərəz nə başın ağradım hər iş genə yolundadır.*
*Həman həmam, hamandı tas hamamçılar əlindədir.*
*Həman şəhərdi bu şəhər, hər işləri yerindədir*
*Söküb qayırsalar genə dübarədən sebarədən.*

*Yetim Cücə*

## UZUN BİR DANIŞIQ

*Keçən nömrənin axırı*

Dediyinizdən belə anlaşılır ki, "Novoye vremya"nın indiyə kimi müsəlmanların barəsində yazdıqları və Menşikovun dedikləri doğru çıxarmış! Sizə bir yandan yəqin çoxlu pul verirlər ki, bir para mətləbləri yazıb müftə camaata yetirəsiniz! Dedim qardaş, sən imanın bizi xata bəlaya salma, sözümü başa düş! Jurnalımızı biz göndəririk şəhərlərə satmağa, satırlar pulunu qoyurlar ciblərinə, olur müftə…

Cənab yazıçı burada bir az fikirləşib sonra dedi: bu sözləri yəqin zarafatla deyirsən, bunlar kənarda qalsın, mən bir şeyi bilmək istəyirəm: sizin məcmuənin iki yüz il bundan sonra əgər bir nömrəsi keçə birisinin əlinə başdan axıra kimi oxuyar bilməz ki, onu hansı əsrdə yazırmışsınız! Niyə jurnalınızda dünya həvadisinə, politikaya, dumanın iclaslarına və xüsusən bu axır vədələr bütün Rusiyanı və Avropanı məşğul edən Beylisin işi kimi bir gurultulu vəqəyə dair bir söz belə yazmırsınız? Dedim cənab R., çox gözəl danışırsan, amma işin birini bilirsən, birini bilməyirsən! Oturmusunuz Londonda ağzınıza nə gəlir yazırsınız, deyən yoxdur burdan dur, orada otur. İngilisdə görürsən arvadlar padşahı və vəzirləri küçədə getdiyi yerdə daşa basırlar, bir kişi tapılmır onların qol-qabırğasın əzsin! Bizə nə dəxli var duma necə oldu, politika belə gəldi, Beylisin işi elə getdi. Bizim oxucularımız o cür cəfəngiyyata qulaq asmazlar. Allaha şükür duma vəkillərimizin hörmətləri, izzətləri və sözləri daşdan keçir, onların qorxusundan Purişkeviç və İkinci Markov ağızlarını açıb müsəlmanların barəsində bir söz danışa bilmirlər, müsəlman qardaşlar da öz vəkillərindən bir dəqiqə qafil olmayıb pulla, malla və dillə onlara hər bir köməklik edirlər. Qaldı ki, Beylisin işi, ona dair biz də istədik bir şey yazaq, amma bizim yaxşı istəyənlərimiz və xeyirxahlarımız var, məsləhət görmədilər ki, bu cür avara şeyləri yazıb oxucularımızın əziz vaxtlarını onu oxumaqlan zaye eyləyək. Doğrudan da müsəlmanlara nə dəxli olan şeydir ki, bir xaçpərəst uşağını bir cuhud tutub öldürüb ya öldürməyib, indi cəzasına yetişib. İki il yarım da navvaxtda yatdı. Cuhudların peşəsi adam öldürüb qanını xəmirə qatıb matsa pişirməkdir. Bizim yerlərdə də uşaqlar küçəyə çıxanda anaları qorxudarlar ki, çıxarsınız cuhudlar tututb aparar. Amma nə qədər çıxıb gəzsələr də indiyə kimi bir cuhudun ixtiyarı olmayıb bir müsəlman uşağını aparıb öldürsün. Gözünə döndüyüm keşiş Pranayts Kiyevin sudunda yaxşıca bütün dünyanın yəhudilərindən və onların tərəfdarlarından qorxmayıb üzlərinə dirənib isbat elədi ki, bir indi deyil, iki min ildən bəri cuhudların elə işi adam öldürüb, qanını xörəyə qatmaqdır…

Bu sözlər yazıçı dostumun bir az beyninə batdı. Axırda soruşdu ki, bunlar hələ öz yerində, sizin məcmuə ki, həftəlikdir bəs niyə belə yubana-yubana çıxır? Ağzımı açdım ki, əsil səbəbini deyəm birdən yadıma düşdü ki, yaxşı deyil ki, adam öz sirrini özgəyə bildirsin. Dedim ki, əslisi bizim bu aylarımız ziqədətülhəram və zihiccətülhəramdır. Yəni mömin və müqəddəs müsəlman qardaşlara bu aylarda çox şeylər haramdır. Xüsusən qəzet və jurnal oxumaq. Biz də bu mülahizə ilə məcmuəni gec-gec çıxardırıq ki, bizdən narazı olub laməzhəb hesab eləməsinlər…

Burada gördüm qonaq qardaş dil məsələsindən və Qafqaz müsəlmanlarının elm və maarifindən söhbət salmaq istəyir, tələsirdim, o məsələlərə dair Londonda yazmağımı vədə elədim…

Qurban bayramı da oldu keçdi, heç dərilərdən bir xəbər çıxmadı.

## ŞERİ-SƏRAZAD

Oldu bayram kəsildi çox qurban
Hər nə dərilərdən pul çıxdı yəqin ki, oldu mali-cibişdan və meykədan…

*Lağlağı*

## QAFQAZ XƏBƏRLƏRİ

Nuxa - Buranın camaatı şəhər qlavası və onun müavinindən çox-çox razıçılıq eləyirlər. Çünki onların səylərinin nəticəsindən şəhərin küçələri və meydanı tərtəmiz və pak pakizədir. İt ölüsü, pişik ölüsü dərman üçün küçədə tapılmaz. Şəhərdə zibil və palçıq kimya hökmündədir. Hətta bəzi barama zavodlarını ki, onların üfunətindən camaat incikli idi qərar qoyublar ki, şəhərin içindən çıxarıb kənarda bina elətdirsinlər.

Şahtaxtı - Oruc tutmaq və yemək məsələsi üstündə ki, orucluqdan bir ay sonra müxtəsər şəkərab olub otuz adam yaralanıb, otuz adam ölüb, otuz adam Sibirə getmişdi qədirxum bayramının münasibətilə hər iki tərəf bir-birlərilə siğə oxutdurub qardaş oldular.

Tiflis - Qarabağlılar ilə iranlılar arasında ki, keçən günlərdə bir yüngül dava düşmüşdü qədirxum bayramı münasibətilə cəmi qarabağlıların cavanları ilə iranlıların qocaları və iranlıların cavanları ilə qarabağlıların qocaları siğə qardaş oxutdular ki, bundan sonra heç bir vaxt belə dava düşməsin.

Naxçıvan - Bank idarəsi rəsmi elan eləyib ki, hər kəs bundan sonra onlardan narazı olub artıq-əskik danışsa bank tamam yeddi gün tətil eləyib, uçot eləməyəcək ki, o adamın səsi kəsilsin.

## RAZIÇILIQ

Naxçıvandan qayıtmış Tiflis artistləri bizim idarə vasitəsilə Naxçıvanda gördükləri qonaqnəvazlıqdan, xüsusən bəylərin və xanların bir neçəsinin onların haqqında elədikləri köməklikdən və yaxşılıqdan yana razıçılıq və təşəkkür eləyirlər.



*Müdir və baş mühərrirlər:*
*Cəlil Məmmədquluzadə, Əliqulu Nəcəfov*

İdarəmizdə "Molla Nəsrəddin" məcmuəsinin 3-cü, 4-cü, 5-ci 6-cı illiyinin yaxşı cildlənmiş kitabları mövcuddur. Qiyməti idarədə 6 manat, sair şəhərlərində poçta xərcilə 7 manatdır. Və həmçinin Molla Nəsrəddinin əsərləri: "Usta Zeynal", "İranda hürriyyət", "Qurbanəlibəy": qiymətləri 20 qəpik, yaxud 3 dənə 7 qəpiklik markadır. "Bizə hansı elm lazımdır" kitabı da var, qiyməti 15 qəpik.

Və genə "Rəhm çeşməsi" və "Poçta qutusu", qiymətləri 5 qəpik. Hər kəs talib olsa xəbər versin naloj təriqilə hər bir məmləkətə göndərə biləriz.



*Электроп. Грузинск. Изд. Товарищества Больш. Ванкская ул.№21.*


کاتبین کرامین
Katibeyni-kərameyn
ثواب یازان
Savabyazan
گناه یازان
Günahyazan
Hacı Mirzə Həsən Ağa Müctəhid
حاجی مرزا حسن آغا مجتهد

17 məhərrəm 1332 **Səkkizinci il** 3 декабря 1913 г.

# ملا نصر الدين

**№26 Qiyməti 12 qəpik.** МОЛЛА НАСРЕДДИНЪ **Цена 12 к. № 26**




بولیتقه عالمندن

*Politika aləmindən*

**Adres:** *Tiflis, Davidov küçəsi nömrə 24.*
**Адресь:** *Тифлись, Давидовская, 24.*
**Teleqram üçün:** *Tiflis, "Molla Nəsrəddin".*
**Для телеграмм:** *Тифлись, "Молла Насреддинь".*
***Подписная цена:***
***На годь - 6 руб.***
***6 месяц - 3 р. 50 к.***
***3 месяц - 2 р.***
***1 месяц - 40 к.***
Adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

**Qafqazda və Rusiyada**
**12 aylığı - 6 manat**

"------------------------" 6 aylığı - 3 manat yarım
"------------------------" 3 aylığı - 2 manat
"------------------------" 1 aylığı - 40 qəpik
*Əcnəbi məmləkətlərdə 12 aylığı - 7 manat*
"------------------------" 6 aylığı - 4 manat

***Tək nüxsəsi idarəmizdə 10 qəpik, özgə şəhərlərdə 12 qəpik.***

## ARVAD MƏSƏLƏSİ

"Camaatımızın cəhalətdə qalmağına baxıb ah çəkincə yaxşı deyilmi onun səbəbini axtarıb mübarizə edək. Bu məsələ əlbəttə arvad məsələsilə mərbutdur. Bu məsələ arvadlarımızın mənfəətinə həll olunsa millətimizin qabağa getməyinə şəkk olmayacaq. Pəs hər kəs öz millətini sevir, onun gələcəyinin parlaqlığını arzu edir, arvadlarının təlim və tərbiyələrinə çalışmalıdır. Onların hüququnu qaytarıb, sərbəstliyini qaytarıb ağıl və zəkasına meydan verməlidir".

Yusifbəy Vəzirovun risaləsindən. "İqbal" 504.

---

Mənim fikrimə bir belə şey gəlir: indi "Molla Nəsrəddin" Allahdan qorxmaya və mollalardan utanmaya götürüb genə, məsələn, bir belə şey yaza. Millətimizin qabağa gəlməyindən ötrü lazımdır ki, arvadlarımız ingilis, rus və erməni arvadları kimi elm oxuyub üzüaçıq gəzələr. Kişilər daha onları zorla çarşov altına və dörd divar arasına qatıb istədiklərini onların başına gətirməyələr. Onlarla hər bir şeydə bərabər olub gündə birini alıb boşamıyalar və mal davar alış-verişi kimi Bakıda iki boynuyoğun telefon vasitəsilə onları alıb satmayalar!..

---

Allah eləməmişdən əgər bir belə şeyi "Molla Nəsrəddin" cürət eləyib yazsa, yerlər zəlzələ elər, aləm dəyər bir-birinə. Hər bir şəhərdən kərbəlayı Heydərqulular, məşədi Haqverdilər sivirməqılınc yüyürər Tiflisə Molla əmini duelə çağırmağa: ordubadlı Seyid Murtəza da hirsini yeməyib düz günə bir mənzil teyyimənazil üz qoyar Kərbəlayi Nəcəfə və oradan Nəcəf müctəhidlərindən Molla Nəsrəddinin küfrünün və qətlinin fitvasını alıb fövri qayıdar Rusiyaya və Culfa gömrükxanasından gizlin çap olunmuş fitvaları oğurluğunca keçirdəndə ağanı ittihadi-islam mübəliğçisi hesab eləyib kağızların yenə tutarlar.

---

Söz vaxtına çəçər. Bir dəfə həmin bu məhərrəm ayında Hacıtərxanda idim. İranlıların məscidində bir mazandaranlı fars mərsiyəxanı var idi.

Hər gün çıxardı minbərə çığırardı, çığırardı, heç ağlayan olmazdı. Çünki mərsiyəyə ağlayanlar hamısı türk idilər. Farsca qananlar da ağlayan deyildilər. Bir gün minbərə çıxıb genə nə qədər çığır-bağır saldı ağlayan olmadı. Üzünü camaata tutub dedi: "Allahdan istiğasə eləyirəm ki, ya mən bu gecə yatıb səhər duranda görüm ki, türk olmuşam, yainki siz fars!.."



Adam olmaz ki, onun qəlbində bir arzu olmasın. Mənim də bir arzum var. Mənim arzum budur ki, Allahın altında ya Qafqazdakı müsəlman qardaşlarımız o qədər dərin oxumuş olaydılar ki, Yusifbəy Vəzirovun yuxarıda yazdığım sözlərinin iki axırıncı sətirini başa düşəydilər, yainki Məhəmməd Əminlərimiz, türk ibn Yafəslərimiz və Yusifbəylərimiz ilə bir dildə və ya tərzdə yazaydılar ki, "Molla Nəsrəddin" oxuyub və qışqırıq salan qardaşlar onların da dilini anlıyaydılar. Onda deyərdim ki: ay müsəlman qardaşlar. Molla əmi qocalıb daha davalıq halı qalmıyıb, hər kəsin sözü varsa və ya dava-qışqırıq fikrindən keçirsə gedib Bakıda müsəlman Kaspisinin idarəsində Məhəmməd Əmin Rəsulzadəni və ya Kiyevdə cavan tələbələrimizdən Yusifbəy Vəzirovu tapıb nə sözləri var desinlər. Daha mollanın dalınca kürk altından boğma çıxartmasınlar…

*(Genə olacaq)*

*Lağlağı*

## TƏXMİS

*İbrahim Tahir Musayevə*
*və Cüvəllağıbəyə nəzirə*

Çoxdur aləmdə mənim qüssəvü dərdi-mihənim
Kül olub başıma dinarə də dəyməz süxənim.
Məcməi-nasidə getməz pula lafi-dəhənim,
Yedim islamı genə qaldı yarımçıq gödənim.
Başdakı ağımı millət edəcəkdir kəfənim.

Yazır hər gün bu qəzetlər bizə yüz latayil
Qalmadı bircə səfeh kim bizə olsun mayil.
Biz neçün bəs bu qəzetlərdən oturduq qafil
O qədər yazdılar axır gözün açdı cahil.
Bir də heyhat yığılsın dağılan əncümənim.

Cibi doldurmağa artıq var idi hümmətimiz,
Bütün islamı dağıtmaqdı bizim niyyətimiz.
Siğəbazlıqdı fəqət əldə olan sənətimiz,
Zərbi-təkfir ilə titrərdi əcəb millətimiz
Hamının hürməti getmiş nə ki yalqızca mənim.

Hansı bir ölkəyə təkrar düşərdi güzərim
Dolanırdı başa pərvanə kimi siğələrim.
Oldu çox məhvəşə dildadə dili-dərbədərim.
İndi bir təkcə Tükəzbanə baxır didələrim
Tumanım, köhnə donum, köhnə cırıq pirəhənim.

Kəndlilər bizləri bilməkdə idi əfzəli-nas,
Bizi etməzdilə hərgiz bəşəriyyətlə qiyas.
Moizə, qüsl təharət sözümüz heyzi-nifas
Hər səfərdə götürərdik ələ yüz çuli-pəlas,
Biz idik çünki bu əmvali-müsəlmanə qənim.

Ərşi-minbərdə bir az boş qoyaraq çanəmizi
Oxuyardıq bu müsəlmanlara əfsanəmizi.
Yıxıb islamı tikərdik özümüz xanəmizi.
Elədim cənnəti-məva kimi kaşanəmizi
Evim abad fəqət beyti-həzəndir vətənim.

*Hərdəmxəyal*



## SUAL-CAVAB

*(Mirbağırlar)*

S - Məşədi İmamqulu! Sən ki, hey Mir Bağır, Mir Bağır deyib çığır-bağır salırsan məni də bir başa sal görüm hansı Mir Bağırı deyirsən ki, mən də o mübarək vücudu tanıyıb dünya və axirətdə xoşbəxt olum, yoxsa sən canına qurban olduğum bizim Gəncədəki Ağa Mir Bağırı deyirsən ki, keçən il Xorasan ziyarətinə getmişdi. Kor gözlərinə ağa şəfa verib açıldı və özü də həmişə xülafayi-səlasənin adlarını ehtiram ilə yad edər və hər kəs fəndi sözü onun yanında söyləsə deyər ki, mən Seyid Bağır ollam, əfəndi olmaram?

C - Yox, Kabla Səfərqulu əmi, o Mir Bağır ağanı ərz eyləmirəm.






İranın hal-hazırı



*Bumi nobət mizənəd dər tarimi-Əfrasiyab*
*Pərdədari mikonəd dər qəsri-qeysər ənkəbut.*

S - Yoxsa Məşhədi, sən Nürgütdü Hacı Mir Bağır ağanı buyurursan ki, bir vaxt Tiflisdə "Molla Nəsrəddin"i minbərdə təkfir edib qətlinə fitva verirdi və sonra neçə müddət idi təşrifi-İran şəhərlərində idi, indi İranda lat-lüt zəvvari-İmam Riza qayıdıb vətəninə gün çörəyinə möhtacdır?

C- Yox. Məşhədi, Mir Bağır ağanı da ərz eləmirəm.

S - Yoxsa Məşhədi, sən o Mir Bağır ağanı buyurursan ki, indi onun nəvəsi Bakıda əyləşib gündə bir kitab yazır və Xaritonov Qazanda Qurani-şərifi təhrif edən kimi bu da Osmanlı tarixini başdan-başa təhrif edir və tarix kitablarını qoyub qabağına onların surətini gündəlik qəzetə yazır?

C - Hə, Kablayı, həman Mir Bağırı ərz eləyirəm, amma bilməyirəm ki, sən onun özündən söhbət açmayıb niyə nəvəsini çəkdin meydana?

- Məgər sən eşitməmisən ki, bir ərəb Bağdadda bir qarğanı bir quruşa və balasını iki quruşa satırmış. Ondan soruşurlar ki, bəs niyə atası o qiymətə, balası o qiymətə. O ərəb nə cavab veribdir?

- Bəli məlum oldu, xub indi de görək onun balası necə yaxşı əməl tutubdur ki, onu tərif eləməkdən sənin ağzın dilinə girməyir?

- Hə, çox yaxşı, indi ki söz açıldı qoy mən onun elədiklərini birbəbir sayım sən gör bu təriflərə layiqdir ya yox? Əvvəla bu vücudi-mübarək neçə ili di İrəvanda kitab mağazası saxlayırdı. Sonra nə oldu, nə olmadısa oradan cilayi-vətən olub getdi İstambula və orada nəqd para sayıb bir kitabxana açıb neçə yüz liraya mağazasını ingilis sığorta cəmiyyətinin idarəsində straxavat elədi, qəzayi-rəbbani nə cür gətirirsə bir gecə bazar qaravulu görür ki, onun mağazası yanır. Qapını sındırıb girir içəri görür ki, ağanın yadından çıxıb şami xamuş etməmiş dükanı bağlayıb gedibdir, hər nə isə ki, böyük xoşbəxtlik olur ki, qaravul tez duyuq düşür. Yoxsa o büzürgüvarın bir müxtəsər səhvindən nəinki bir dükan bəlkə İstambulun bir məhəlləsi bütün bütünə yanıb məhv olub gedəcəkmiş.

- Əhsən Kablayı əmi, əhsən, sən yerdən göydən xəbər verirmişsən. Doğrudan da böylə bir büzürgüvarları hamıya vaibdir tanısın. Çünki gələcəkdə onların adı tarixdə səbt olunacaq və millət onlara heykəl yapdıracaqdır. Çox sağ ol, səndən çox-çox razı oldum.

*Sarsaqqulubəy*

Qapaz (…) A

Su satan, kömürsatan, çayçı olub artistimiz…

Dəlləyə şəkk olamaz, zərgərə yoxdur sözümüz!..

Səhnəmiz oduha… edir, övci-fəza cövlanı,

Əcəba, kimdi deyən? Qaldı geri millətimiz!

*Həvəskar*

## ŞEYTANBAZAR XƏBƏRLƏRİ

Bu il burada saxlanılan təziyə və qəbiristanda qurulan büsat o qədər şükuhlu olmadığından doktor Muxtarovun təhti-sədarətində böyük bir iclas olub qərar qoyulmuşdur ki, gələn il üçün ayrı bir dəstgahlar düzəltsinlər və intelligentlərdən məxsus bir ağköynək dəstəsi çıxsın. Eşitdiyitmizə görə dəstəbaşılığı da hörmətli doktor qəbul eləmişdir.

## TELEQRAF XƏBƏRLƏRİ

Batum – iyirmi ildir lazların hümməti ilə açılıb imdiyə kimi davam eləyən "Hacı hamamı" adlı səkkiz şöbəli gimnaziyanı bu yaxınlarda lazların tərəqqiyə və maarifə günü gündən rəğbətinin artdığı cəhətinə bir darülfünun şəklinə gətirmək niyyətilə ağsaqqallar lazımi yerə icazədən ötrü ərizə veriblər. Eşitdiyimizə görə bu darülfünun bəzi şöbəsini də abxaz qövmünün içində açmaq fikrindədirlər.

Berlin – Burada məscid olmadığından Məhəmmədəli tasua gecəsi nəzrini yerinə yetirməyə ayrı bir əlac tapmayıb bu məsələdən ötrü aldığı şamları ayaqyalın kəlisaları gəzib yandırmaq fikrində imiş. Amma yerli hökumət iks şahın bu hərəkətində bir siyasi bijlik mülahizə eləyib mane olmuşdur. Ona görə Odessada Abdulla zan xacəyə teleqraflan qərardad eləyib ki, bu nəziri orada Seyid Vəlixan icra eləsin.

Paris - İrandan qalxmış və Avropanın hər bir şəhərinə dağılmış İran əyanları məhərrəm münasibətilə Parisə yığılıb təntənəli surətdə təziyə saxladılar. Sinəzən dəstəsinin sərkəşliyini zillisultan, ağköynək dəstəsinin başçılığını süpəhdar qəbul eləmişdi. Bunların bu cür açıq nümayişləri siyasi dairələrdə böyük danışığa səbəb olub Fransa hökumətini qorxuya saldı.

Şamaxı - Russki-tatarski işkolanın müəllimləri mərsiyə və növhə oxumaq imtahanını tutub şəhadətnamə aldılar. İnşallah gələn il on gün məhərrəmi bütün tətil elətdirib işqol uşaqlarından və malay realistlərindən məxsus bir dəstə pərgarlayıb əzadarlığa məşğul olacaqlar.

## 18-Cİ NÖMRƏDƏKİ QIRX HƏDİSİN MABƏDİ

16) Midadul-uləməi əfdalu min dimə-iş-şuhədə, yəni mollaların mürəkkəbləri şühəda qanlarından əfzəldir. Bu hədisi-şərifdən bu məna çıxır ki, aşura günü başyaranlardan hər neçəsi ki, dərəceyi-şəhadətə yetişirlər onların şəhadəti dinə və millətə o qədər fayda verməz, nə qədər ki, mollalar 7 yaşında qıza və 8 yaşında oğlana kəsdikləri kəbinlərin mənfəəti olar. Belə ki, neçə il bundan qabaq Naxçıvanda bir mömin hacı 11 yaşında baldızını 12 yaşında əmisi oğluna öz məsləhəti ilə əqdi-nikah elətdirmişdi. Həman kəbində sərf olunan mürəkkəbin fəziləti bu oldu ki, yazıq qız dörd-beş il kəbin altında qalandan sonra diri-diri məzara gömülüb dünyadan nakam getdi.

17) Uləməu umməti afdalu min ənbiyəi bəni israil. Mənim ümmətimin mollaları bəni İsrail peyğəmbərlərindən əfzəldirlər. Yəni bu hədisin mənası budur ki, bəni İsrail peyğəmbərləri necə ki Allah tərəfindən hər birisi öz qövmünə bir din və şəriət gətirərdi, mənim ümmətimin mollaları hər kənddə və hər qəsəbədə və hər məhəllədə öz tərəflərindən həftədə bir din, bir şəriət çıxartmaqda onlardan əfzəldirlər. Belə ki, Bakı qazisi təsəttüri-nisvan məsələsində öz tərcümə elədiyi Quranın məzmununu bir həftə qəbul eləyir, ikinci həftə danır.

18) Mən cəddə vacədə va ciddə. Hər kəs çalışdı axtardı tapdı. Yəni necə ki, neçə vaxt idi idareyi-ruhaniyə çalışırdı ki, elmi-ilahi müəllimi nə qiyafədə olmalıdır tapsın, bu axırlarda tapdı ki, gərək müəmməm, yəni başısarıqlı olsun və habelə Bakıda tapıblar ki, qızı bir iki saatın içində telefon vasitəsilə bir oğlandan boşadıb başqasına ərə vermək olar. Necə də ki, bu günlərdə telefon ilə bu nikahi-şər'i əmələ gətirib həman gecə qızı Tutinisa əmiqızı ilə görmədiyi və bilmədiyi bir oğlanın evinə göndəriblər.

19) Ən-nəsu alə suluki mulukinim. Camaat öz padşahlarının sülukunda olmalıdırlar. Yəni padşahları nə fikir və nə halət sahibi olsa, rəiyyət gərək ona təbəiyyət eləsin. Məsələn, necə ki, iranlılar qacariyyə silsiləsinin təhti-hakimiyyətinə düşəndən icmaən qulampara olublar. Habelə osmanlılar sultani-haliyyənin kəsalət və süstlüyünə təbəiyyət edib ömürlərini gecə-gündüz çayxanalarda qəlyan çəkmək və acı qəhvə içmək ilə keçirdirlər.

*(genə olacaq)*

## POÇTA QUTUSU

Duşaqda Ə.Ə. cənablarına: Yazırsan ki, mən müsəlman papağı qoyanda uruslar içlərinə qoymuyurlar. Deyirlər ki, paşol von qarapişik. Sən oğrusan çıx içimizdən. Urus papağı da başıma qoyanda müsəlmanlar deyirlər sən dindən, məzhəbdən dönmüsən. Əvvəla, sən o müsəlman qardaşlara de ki, mən adamam, çaxır deyiləm ki, dönüb qıjqırıb sirkə olam, əgər qəbul etməsələr əlacın başıaçıq gəzməkdir, vəssalam.

*Müdir və baş mühərrirlər:*
*Cəlil Məmmədquluzadə, Əliqulu Nəcəfov*



*İdarəmizdə "Molla Nəsrəddin" məcmuəsinin 3-cü, 4-cü, 5-ci, 6-cı illiyinin yaxşı cildlənmiş kitabları mövcuddur. Qiyməti idarədə 6 manat, sair şəhərlərdə poçta xərcilə 7 manatdır. Və həmçinin Molla Nəsrəddinin əsərləri: "Usta Zeynal", "İranda hürriyyət", "Qurbanəlibəy". Qiymətləri 20 qəpik, yaxud 3 dənə 7 qəpiklik markadır. "Bizə hansı elmlər lazım?" kitabı da var, qiyməti 15 qəpik.*

*Və genə "Rəhm çeşməsi" və "Poçta qutusu". Qiymətləri 5 qəpik. Hər kəs talib olsa xəbər versin. Naloj təriqilə hər bir məmləkətə göndərə bilərik.*



*Электроп. Грузинск. Изд.*
*Товарищества Больш. Ванкская ул. № 21.*

***İstambullu türk: Zati-mərifət səmati-alilərinin mükalimeyi-vicdan nəvazanəsindən şu qəlbi-məftun və məhzuni-acizanəmizə, yəni cəhətə ruhaniyyəsi natiq və külliyyati-ümuri müdrik olması hesabilə dəxi isteyfayi-ləzayizi-ruhaniyyəsi üçün bittəb məsaili-hikməti-ilahiyəyə malik və mayil və qidayi-ruhanisi məsabəsində vaqe şer və inşa və nükət və məzaya istemaına pək aşuri-rağib və mütəhalik ola gəlmişdir…***




***Təbrizli türk: gədə, sən nəmənə deyirsən?***
***Təbrizdə bizim səmavarımız hamam burğusundan üç təbilə kimi qaynar!..***




***Ay haray! Qafqaz, Qafqaz! Panislamizm!***
***Vicdanıma and olsun mən qızımı bolqara, qrekə verməyə razıyam, amma şiə türkə versəm atama min təsbeh lənət olsun!..***

ملانصرالدّين

№27 Qiyməti 12 qəpik. МОЛЛА НАСРЕДДИНЪ Цена 12 k. № 27




*"Fəscidu süqəad-dauləti fəxərru"*, yəni səcdə eləyin Səməd xana və xər olun.

**Adres:** *Tiflis, Davidov küçəsi nömrə 24.*
**Адресь:** *Тифлись, Давидовская, 24.*
**Teleqram üçün:** *Tiflis, "Molla Nəsrəddin".*
**Для телеграмм:** *Тифлись, "Молла Насреддинь".*
***Подписная цена:***
***На годь - 6 руб.***
***6 месяц - 3 р. 50 к.***
***3 месяц - 2 р.***
***1 месяц - 40 к.***
Adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

**Qafqazda və Rusiyada**
**12 aylığı - 6 manat**

"------------------------" 6 aylığı - 3 manat yarım
"------------------------" 3 aylığı - 2 manat
"------------------------" 1 aylığı - 40 qəpik
*Əcnəbi məmləkətlərdə 12 aylığı - 7 manat*
"------------------------" 6 aylığı - 4 manat

***Tək nüxsəsi idarəmizdə 10 qəpik, özgə şəhərlərdə 12 qəpik.***

## ARVAD MƏSƏLƏSİ

*(Keçən nömrənin axırı)*

Bir para şey var ki, adam bilər, çox şey var ki, bilməz. Bəzi şey də var ki, adam istər, bilinməz. Bakıda verilən "Şəlalə" məcmuəsində çox dərin-dərin və mənfəətli məqalələr olur. Amma heyif ki, adam nə qədər hıqqınırsa bir şey başa düşə bilməyir. Dünyada bisavad olmaqdan da yaman dərd yoxdur! Öz-özümə deyirəm, nə olardı mən vaxtında gedib Misirdə, Nəcəfül-əşrəfdə ərəb dilini, İstanbulda türk dilini və Şirazda fars dilini öyrənmiş olaydım ki, indi "Şəlalə"ni əlimə alanda oxuyb anlayaydım, daha nəinki "Şəlalə"nin nömrələrində təsəttüri-nisvanə dair yazılan məqalələrdən heç bir şey qana bilmiyəydim.

Doğrudan möhtərəm "Şəlalə"nin 44-cü nömrəsində təsəttüri-nisvanə dair Ə.Həqqi cənabları yaxşı moizə eləyibdir.

(Afərin sənə, ey Quran ayələrini qırıldadan belə sözlərə mərhəba gərək!)

Bizdən soruşan olsaydı bakılılara bir belə məsləhət görərdik. Bakıda indi məscid azdır və Ağa Mir Tağı ağa da ki, vədə eləyibdir "Səfa" cəmiyyətindən ötrü bir teatr qayıtdırsın. Yaxşı olar ki, onun əvəzində bir yaxşı böyük məscid bina eliyə tainki orada növbətilən bir gün Mir Məhəmməd Kərim ağa və bir gün Ə.Həqqi cənabları çıxıb təsəttüri-nisvanə dair moizələr edib xalqı müstəfeyz edələr, yoxsa qəzet və jurnalın o ləyaqəti yoxdur ki, orada din ehkamına dair uzun uzadı bəhslər olsun. Bunların hamısı keçəndən sonra genə Allah bərəkət versin "Şəlalə"yə ki, Qafqaz müsəlmanlarının boynuna böyük haqlar qoyur, yəni onların həmi dilini islah edir, həmi dinin. İnşallah çox çəkməz ki, Qafqazda bir Xalidi məzhəbi də çıxıb o biri məzhəblərin cərgəsinə daxil olar…

Dünən Urusyetin içərilərində oxuyan bir student dostum belə kağız yazıb:

Yoldaşım Lağlağı, xəbərin yoxdu? Axır bir ləmsə qızı sevmişəm, o da məni sevib, indi onu istəyirəm alam!.. Hərçənd bu söz sənə bir qədər qəribə görsənəcək, amma qoy açığın yazım gör haq mənim tərəfimdədir, ya yox? Bu il yayı getmişdim vətənimizə. Atam, anam məni yaxaladılar ki, gərək zor ilə on yaşında əmin qızını alasan. O da olmasa

qohumlarımızın birinin qızını nə cür olsa gərək sənə nişan qoyaq! Bu yan o yan, onlar dedilər, mən dedim, axırda atam, anamla savaşıb, acıq eləyib çıxdım gəldim oxuduğum yerə və indi burda acıqnan bu ləmsə qızını alıram. Axır sən özün mülahizə elə! Mən üzü gözü örtülü, elmsiz və tərbiyəsiz bir qulyabanını necə götürüm özümə arvad eliyəydim və bütün ömrümü əzab ilə keçirəydim? Bu cür evlənmək yaraşıb o kablayı və hacılara ki, bu gün alıb on gündən sonra boşayacaqlar. Biz müxtəsər oxumuşlar əbədən elə şeyləri eləyə bilmərik. Daha indi özün bil, istəyirsən məndən inci, istəyirsən qal!..

*Səni istəyən F.H.*

Bəli bu bizim studentimizin kağızı. Bu da Ə.Həqqimizin məqaləsi! "Ey məgəs ərseyi simurğ nə cövləngəhe tost!" Vallahi mənim kimilərin Ə.Həqqi və Xalid xürrəmlərin qabağında lağlağılıq eləməyim xilafdır, çünki onların ayağını biləni, mənim başım bilməz! Əlbəttə, məsləhət təsəttüri-nisvandadır, yəni arvadların örtülü gəzməyindədir ki, Xalidlər Xürrəm olsunlar.

*Lağlağı*

## ƏDƏBİYYAT

### MÜSİBƏT GÜNLƏRİ

*Bitdi əyyami-müsibəti-təziyə!*
*Rövzəxanlar indi olmuş didətər?!*

*Sonramı təsir edib bunlara qəm,*
*Keçdi ki, mövsim, nədəndir bu kədər?*

*Ağladı hər kəs zamanında fəqət:*
*Ağlamaq vaxtında bunlar güldülər!*

*Ağlayırlar indi aya bəs neçin?!*
*Tazələndi sonradan matəm, məgər?!*

*Ağladır bunları ya, bir özgə dərd!*
*Dərdi-çayü-aş, qeydi-simüzər?!*

*Bunları ağlatmayır qətli-Hüseyn!*
*Ağladır zənn eylərəm kari-digər*

*"Mən bəka" ilə daşı ağlatdılar*
*Özlərinə verdi "əv əbka" səmər*

*"Əv təbakə" daş ürəklilər üçün:*
*Nəfli olmağı verdilər xəbər!..*

*Hər bəbəkdən ayrılan bir qətrə su*
*Minbərin üstündə oldu bir göhər!*

*Bir göhər məhşərdə oldu hər kəsin:*
*Dağ misli cürmin tərazudə əgər!*

*Vacib oldu ağlayanlara behişt*
*Keçdilər qıl körpünü ərbabi-şər*

*Yol kəsənlər oldu bir dindari-pak,*
*Qan içənlər cənnətə qıldı güzər!*

*Rəng, rəng ortayə sərpildi kəlam*
*Dürlü, dürlü mürği-əfkar açdı pər,*

*Gunə-gunə toxmi-kinə həm fəsad:*
*Gizli-gizli qəlblərdə tutdu yer,*

*Cəhl üçün açıldı bir rahi növin*
*Elmə qarşı bağladıldı babi-dər.*

*İbrət üçün, can edən qurban Hüseyn*
*Göz yaşıçin vermiş oldu cism, sər,*

*Hasili: oldu nifaqü qəm məzid,*
*Qəlblər paslandı, lənət bər Yezid!*

*Keyfsiz*

## QAFQAZ XƏBƏRLƏRİ

**Qazaq** - Bu gün burada Camal ağa adlı həştad yaşında bir mürşid əyalını zifaf məclisinə göndərib evlərindəki on yaşında qulluqçunu kəsrəti-məhəbbətdən özünə məhrəm etmək istəyibdir. Hərçəndi ki, sonra ağanın qarısı gəlib mətləbi duyub ovqattəlxlik edib ağa üçün biehtiramlıq olubdur. Amma sağ olsun ağanın rəfiqi Çingiz ağa fövri yetişib qoymayıb ki, qanı qan ilə yusunlar. Aralığa düşüb iyirmi tümən qulluqçunun qoca nənəsinə rüşvət verib qızı Camal ağaya şər'i hərəm edibdir. Allah mübarək və oğullu-qızlı eləsin.

**Nuxa** - Gimnaziya barəsində olan keşməkeşlər ki, bir tərəf istəyirdi şəhərin aşağa məhəlləsində bina olunsun, bir tərəf istəyirdi yuxarı məhəllədə. Şükür olsun Allaha sülh ilə qurtardı. Yəni hər iki tərəf qət

*Hiyleyi-şər'i*



***Zəifələr, mən dediyiniz qiymətə razıyam, amma bu şərtilən ki, siz qaçasınız mən hansınızı tutsam şər'i malım olsun!***

***Gəl zəifə, gəl, əsirəmsən, əsirəm!!!***

Торговля поломниками въ Одессе, Батуме и Баку




*Ay mal-davar alan, biri on manatdan əlli manata kimi.*

*Ay hacı alan cütü bir manata.*

etdilər ki, gimnaziya açmağı bilmərrə mövquf eləsinlər ta bəlkə bu nifaq və ədavət aralıqdan götürülə. Rəvayətə görə gimnaziyaya qoyulan pula şəhərin çaylağına böyük sədd çəkəcəklər ki, sel gələndə şəhərə afət yetişməsin.



**Şamaxı** - Bu gün realni məktəbinin şəriət müəllimi Molla Əlibəy direktorun hüzurunda gözəl bir surətdə imtahan verdi.

Belə ki, direktorun qünut barəsində elədiyi suala bu cavabı dedi ki, göydən bizə həmişə nur yağır, biz əlimizi o səbəbə qünuta yuxarı tuturuq ki, nur dolsun ovcumuza sürtək mübarək üzlərimizə. Yaşasın belə Molla Əlibəylər.



## DUA XƏRİDİ

Aşura günü Sərab kəndində:

Bir nəfər məşədi - Axund ağa, al bu bir manatı, mənim atamı, anamı behiştə daxil elə.

Rövzəxan - Xudaya, xudavənda, səni and verirəm imam Hüseynin Kərbəlada çəkdiyi zəhmətlərə bu kişinin ata-anasını behiştə daxil elə.

Bir kərbəlayı - Ay ağa, başına dönüm al bu bir abbasını mənim qardaşıma bir oğul kəramət elə…

Rövzəxan - Allah! Sən bunun qardaşına bir övladi-zükuri-saleh kəramət elə…

Kəndin mülkədarı Kərbəlayı Məhəmməd Cəfər - Ay ağa, ay ağa, ay ağa, ay ağa sənə qurban olum, al bu üç şahını sinənin odlu vaxtında mənim keçilərimə bir yaxşı dua eyləgilən!

Rövzəxan - Camaat! Siz Allah bir amin deyin. Camaat hamısı: Amin, amin.



Rövzəxan - İlahi! Ey həzrət Musanın qoyunlarını dişi, ala bula doğuzduran Allah! Səni and verirəm bu imam Hüseynin yetmiş iki şühəda ilə Kərbəlada axıtdıqları qanlara, Kərbəlayı ağanın keçilərini yerin göyün bəlalarından mühafizət elə! Allah, onun keçilərinə bərəkətini şamil elə. Allah, onun keçilərini qurtdan saxla.



## TƏSƏTTÜRİ-NİSVAN

*Vəzi-vaizdən həmişə huriyə həmdəm çıxar*
*Yəni cənnət aşiqi bir dəsteyi-biğəm çıxar.*
*Qəfləti, cəhli qüruri bir yerə yığsaq əgər*
*Seyyidi-Zərgərlə Rahil, Xalidi-Xürrəm çıxar.*

*Tikançı*



## 26-CI NÖMRƏDƏKİ QIRX HƏDİSİN MABƏDİ

20) İxtilafu umməti həsənətun, mənim ümmətimin ixtilafı həsənədir. Yəni bu hədisdən bu mətləb anlaşılır ki, islam hökmdarlarının arasında olan bu qədər ədavət və düşmənçilik məsələn: İran ilə Osmanlının sərhəd məsələsi, Mərakeşdə Sultan Əziz ilə Molla Həfidin, İranda Salarüddövlə ilə Əhməd şahın aralarında vaqe olan qanlı çarpışmalar və Buxara xanı ilə Xivə xanının daimi düşmənçiliyi, deyil məgər həsənə.

21) Va mə min mauludin illə fəqad yuvallidu fi dini-l-isləm summə əbvahum yəhudəni va yansurani va yəmhusəni, yəni İran əhli, ələlxüsus, təbrizlilər anadan azadixah və vətəndust doğulublar. Sonra onları "Tovfiq" ruznaməsinin müdiri Mirzə Hüseynxan müavini-divan-müstəbid və irticapərəst eləyibdir ki, istəyirlər Azərbaycan bütün bütünə İrandan mücəzza olsun və habelə də Osmanlıda ittihadü-tərəqqi firqəsinə daxil olan bir para şarlatanlar səbəb olurlar ki, Türkiyədə cürbəcürə etilafi-hürriyyət, əhrar və şəriət istəyən, partiyaları meydana çıxır.

22) Əl-muslimu mən səliməl-muslimunə min yədihi va min lisənihi, yəni əsil müsəlman deyilən Bakı, Gəncə, və İravanlı qardaşlardır ki, onlardan əbəda qətli-nəfs baş verməz və onların dincliyindən və rahatlığından ildə o şəhərlərdə bir nəfərin də burnu qanamaz.

23) Mən arafə nəfsəhu faqad arafə rabbəhu, yəni hər kəs öz nəfsini tanıya və özü kim olduğunu bilə betəhqiq ki, Allahın tanıyıbdır. Bu hədisin məzmuni-şərifindən bu çıxır ki, hərgah Sultan Əhməd şah özün tanıyıb həddi buluğə çatsa idi özü öz məmləkətini sülh və müsalimət ilə idarə edərdi, daha İranda bəxtiyarilər ilə jandarmların arasında elə bir böyük ədavət düşüb Cənubi İranı tarmar etməzdilər.

## TELEQRAF XƏBƏRLƏRİ

İstanbul - İran Osmanlı sərhəd məsələləri Allaha şükür Osmanlı dövlətinin xeyrinə kəsildi və bu barədə Türkiyənin hər tərəfində şadyanəlik oldu.

Tehran - İstanbulda olan İran səfirinə hökm olunubdur ki, gedib ingilis və rus səfarətlərinə razıçılıq və təşəkkür etsin ki, Türkiyə ilə olan sərhəd məsələsində ona əziyyət və zəhmət verməyiblər və özləri öz aralarında təhdidi-hüdud eyləyib razı olmayıblar ki, İran elçisinə başağrı olsun.

## MÖCÜZƏ

Təbrizdə nəşr olunan elmi, fənni, əxlaqi gündəlik "Tovfiq" ruznaməsinin 24-cü nömrəisndə dərc olunan teleqraf xəbəri:

Ərdəbildən Təbrizə tasua günü bir dəstə sinəvuran və bir dəstə zəncirvuran Ermənistan məhəlləsindən keçirmişlər. Bir nəfər Simon adlı erməni onlara istehza və rişxənd edib fövri üzü iflic və ağzı əyilibdir.

## POÇTA QUTUSU

Şer nümunələri
Füqəralar sözü:
Xaliq bizə mollaları sultan yaradıbdır,
Zəhmətdə bizi, onları tərxan yaradıbdır.
Yevropalılar görsələr bir çalmalı molla
Söyləllə əcəb şəkldə xortdan yaradıbdır
Zahirdə əba ilə qəba ilə dolansın
Batində də konyak ilə şanpan yaradıbdır.

*Nisac*

## A MOLLA!

Axır nə gərəkdir çəkəsən özgə xəyalı
Kim aldı cənubi, dəxi kim satdı şimalı
Kim düşdü o zülmatə və kim oldu ziyalı
Çək başına yorğanını yat görmə bu halı
Görsən olacaqsan yenə divanə, a molla!

*Qudurmuşbəy*

## BUXARAYİ-ŞƏRİF

Molla, bu sözlər pis ola daldala
Yaxşı gər olsa yazasan jurnala
Söylə bizim qazi gilan saqqala
Quşbəyiyə həm o biri naqqala
Milləti soy təngələrin qarmala
Min atına Şirbidinə yorğala
Mütrübü sal ortalığa fırlana
Vur döşünə, saqqalını yırğala

*Dəbəng*

## NUXULULAR

Ey Şəki noldu bəs bir bu qədər cəmiyyətin
Yoxsa ki, göz dəyib balam, tezcə puç oldu hümmətin
Çatdımı elmə, sənətə bu gözükor cəmaətin
Daşdı, töküldü qoymayın çöllərə elm sənətin

*Kabla Pirverdi*

## ŞULAVERDƏN KƏRBƏLAYİ MOLLA İSMAYILIN ZƏBANİ-HALI

Sən nə deyirsən mənə dövran hanı
Basdı füsunkar üləma dünyanı
Seyyidiniz indi açıb meydanı
Əksinə təfsir eləyir Quranı.
Mollanızın qoy quru yerdə yanı
Qalsın edə nalələr inşa pilov
Ah, məni yaxdı müsəmma pilov
Var-yoxumu eylədi yəğma pilov.

*H.M.*

*Müdir və baş mühərrir:*
*Cəlil Məmmədquluzadə, Əliqulu Nəcəfov*



*Электроп. Грузинск. Изд.*
*Товарищества Больш. Ванкская ул № 21*




*Gədə, gəlin çıxaq gedək, bizə ki növbət yoxdur!*

6 səfər 1332 **Səkkizinci il** 21 декабря 1913 г.

# ملا نصر الدين

**№28 Qiyməti 12 qəpik.** МОЛЛА НАСРЕДДИНЪ **Цена 12 k. № 28**

Женский вопрос

Təsəttüri-nisvana dair



*Allah sizə kömək olsun ey mehriban müsəlman xanımları.*
*Çalışın mən biçara və bədbəxt bacınızı da bəlkə azad edəsiniz.*



**Adres:** *Tiflis, Davidov küçəsi nömrə 24.*
**Адресь:** *Тифлись, Давидовская, 24.*
**Teleqram üçün:** *Tiflis, "Molla Nəsrəddin".*
**Для телеграмм:** *Тифлись, "Молла Насреддинь".*
***Подписная цена:***
***На годь - 6 руб.***
***6 месяц - 3 р. 50 к.***
***3 месяц - 2 р.***
***1 месяц - 40 к.***
Adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

**Qafqazda və Rusiyada**
**12 aylığı - 6 manat**
"------------------------" 6 aylığı - 3 manat yarım
"------------------------" 3 aylığı - 2 manat
"------------------------" 1 aylığı - 40 qəpik
*Əcnəbi məmləkətlərdə 12 aylığı - 7 manat*
"------------------------" 6 aylığı - 4 manat

***Tək nüxsəsi idarəmizdə 10 qəpik, özgə şəhərlərdə 12 qəpik.***

## ORDUBAD BOZBAŞI

Bu yaxınlarda Təbrizdən gəlmiş bir tanışım bir belə şey nağıl eləyir: Təbrizdə indi zindanlar belçiklərin idarəsinin altındadır. Həbsxana qulluqçularından birisi gəlib bazarda pul yığardı ki, gedib Məşədi Həsən adlı dustağa çörək alıb versin. Soruşuram ki, filankəs, niyə bəs sən çörək alıb verirsən, məgər sizin həbsxanada dustaqlara çörək verməzlər? - Deyir ki: bizim zindanın böyüyü Müsyö Lajindir. Gedib deyirəm ki, müsyö, çörək yoxdur Məşədi Həsənə verməyə, pul verin gedib alım. Cavab verir ki, çörək yoxdursa nəcis ver yesin!..

Qafqazın bir guşəsində Ordubad adlı gözəl və möminlər yığıncağı bir şəhər var. Bu şəhər indiyə kimi Nəbati, Fəqir, Sidqi və Səid kimi bir para cəfəngiyyat cızmaqara eləyib adlarını yalandan şair qoyan laməzhəblərdən savayı, Seyid Mürtəza və Ağ Seyidin uşaqları kimi dindar, pak və müqəddəs vücudlar da yetiribdir ki, onların duasının bərəkətindən biz fəqir bəndələr də yeyirik, gəzirik və yer üzündə yaşaya bilirik.

Bu şəhərin darülfünunlarında ticarət və ekonomi elmlərin mükəmməl surətdə keçirlər. Bu elmlərin nəticəsidir ki, bir xörək çıxardıblar ki, Qafqazda və İranda məlumdur. Bir girvənkə əti salarlar çölməyə, üstündən əllərinə nə gəlsə: qaxdan, paxladan, noxuddan, heyvadan, kartofdan, pamadordan, gilənar qurusundan və hər cür lobyadan və qurut-qəylədən doldurarlar içinə, pişib həl-məl olar, daha yeyən vaxtı, əti noxuddan, noxudu qaxdan və heyvadan ayırmaq olmaz. Amma bu Ordubad bozbaşı çox gözəl və ətirli xörəkdir.

İranın indiki halını hər vədə nəzərimə gətirəndə nədəndirsə həmişə Ordubad bozbaşı yadıma düşür. Bu mənim rəyim. Görək Tehranda çıxan "Qərq" cəridəsi on səkkizinci nömrəsində bu barədə nə yazır və İranın indiki halını nəyə oxşadır?..

"Haləti-haliyeyi-İran be haləti-kəştiyi mimanəd ke be tufani-əzimi oftadə misli-adəmi-qəriq dəstü pa mizənəd…"

Yəni İranın indiki halı, bilatəşbeh bir gəmiyə bənzəyir ki, böyük bir tufana düşüb qərq olmaqdadır. Nə bir kömək eləyən, nə bir nicat göstərən yoxdur.

Gəmiçilər, miniklər hamısı dəyib bir-birinə, it yiyəsin tanımır.

"Qərq" rəfiqimin bu yazdığına, mən aşikar deyirəm ki, şərik ola bilmərəm. Bu cür sözlər mənim beynimə batmaz. Onun fikri axırda İranı da özü kimi qərq etməkdir. İranın nəyidir? Allaha şükür fəal, işgörən və bütün Avropanın politikasını beş barmağı kimi bilən nayibüssəltənəsi, yaxşı bacarıqlı vəzirləri, Mirzə Rza xan Daneş kimi öyrədənləri, şivedlərin, belçiklərin bərəkətindən münəzzəm həbsxanaları, jandarmları, fələqqələri, Səməd xan kimi adil və rəhmdil hökmdarları. Çətin bir sərhəd məsələsi idi ki, o da asanlıqla həll olundu. Mən genə deyirəm ki, yazanda elə şey gərək yazasan ki, adam inana bilə. Bağlanan "Bərq" qəzeti sən Allah gör nə yazır? Elə yerində bağlayıblar. Sərhəd məsələsindən başlayıb bir az atılıb düşəndən sonra deyir ki, bizim dövlət məmurları həmişə dövlət işlərindən artıq özlərinə imarət və park qayırmağa vaxt sərf eləyiblər. Yalansa qəmiş qələmin əlində qurusun, ay belə yazıçı! Necə ki qurudu. Bu yazıçılıq deyil, ona-buna şər atmaqdır. İran vəzirlərinin haqqında bu cür böhtanı yazanın gərək nə imanı və nə insafı olmaya! Özgə vəzirlərin də yanında bəndəçiliyimiz olmamış olsa da biz əmir Nö'yanı qədimdən tanıyırıq və onun xeyirxahlarındanıq. Biz and içə bilərik ki, cənab Ərfəddövlənin nə Tiflisdə, nə Borjomda, nə İstanbulda, nə Peterburqda və ya ayrı yerdə imarəti yoxdur!..

*(Genə olacaq)*

*Lağlağı*



**KEYF ET!**

*Gəldi qatari-madmazel durma kənarə, kablayı,*
*Söyləmə tövbə etmişəm başla dübarə, kablayı.*
*Tay-tuşun iştə zallara görüncə rağib oldular*
*Lyuba, Tamara, Şuraya hər biri sahib oldular*
*Həccdə tövbə eyləyib zalda kazib oldular,*
*Yaxşı ovun məqamıdır gəl bu şikarə, kablayı.*

*İbrət ilə nəzər edib bir kərə gör ki Tehranı*
*Yetmişi adlayıb kişi tansı həmişə ceyranı*
*Yandım əlindən ay dəli gör o jəyani-bürhanı!*
*Hər gecə şur ilə dönür təlx xiyarə, kablayı.*

*Ondan əlavə can dadaş hər gecə koffesin içir*
*Bulvarı seyr edir ikən yaxşı madamları seçir*
*Fənar dibində ya baxır, pis isə yan basır qaçır,*
*Hövslətəng olma gəl təhti-fənara, kablayı.*

*Bir də sənə nişan verim qonşumuz ol Cahanhalı*
*Parə füruş etməyə tay olamaz ona Alı*
*Bakarada necə deyir şövqilə yüz manat xalı*
*Bəsdir özünü söykədin köhnə divara, kablayı!*

*Durma gözətləyir səni göstər olara şəsti sən*
*Həm xozeyin xozaykaya şövqilə ver ki çisti sən*
*Bir də işin düşəndə lap çaldırasan da jesti sən*
*Gəzmə bu istilərdə çox bunca avarə, kablayı!*

*Varsa beş on yüzün əgər tezcə ora ayaq basa*
*Oynaya-oynaya gecə yüzlüyü ver Anastasa*
*Vur o şərab, piyvəni eylə zakuska kolbasa*
*At daha küftə bozbaşı gəl bu nahara, kablayı!*

*Eyb eləməz beş altı ay gec dolananda külfətin*
*Qorxma beş altı ay ilə getməz əlindən ismətin*
*Köhnəyə yoxdu, var inan tazəcə canda qismətin*
*Sidq ilə qıl nəzər gözü nazlı xumarə, kablayı!*

*Quleybanı*



**ƏSHABİ-KƏHF**

Bizim Naxçıvan şəhərində hər vaxt ki, bir təziyə məclisi, yainki təkyə* və ya bir ehsan və ya bir qonaqlıq oldu və şəhərin ağbaş, göybaş və sarıbaşları cərgə ilə dallarında mütəkkə və altlarında döşək yuxarı tərəfdə əyləşdilər, danışmağa heç bir söz tapmasalar, başlayacaqlar Əshabi-kəhf barəsində bəhs eləməyə. Biri deyəcək

* Təkyə-bir şəxsin nəzir deyib evində mərsiyə oxutdurmağına deyərlər... il on iki aydırsa, on üç ay evlərdə təkyədir.




*Zəifləşdikcə millət, bu kökəldi*
*Yedi, içdi şişib bu həddə gəldi.*




*Ay qadam gözünə düşsün! Bu qalmışdı ki, səksən yaşda*
*ola-ola on yaşında qaravaşa əl atasan?..*




*Hər nə cür söysəm ürəyim soyumayacaq.*
*Ax tı kərbəlayı, sən nə vədə adam olacaqsan?*

ki, əsl Əshabi-kəhf həmin Naxçıvanın iki ağaclığında olan mağaradadır ki, hər il baharda arvad-uşaq, böyük, kiçik gedib oranı ziyarət edib həmi kef çəkirlər və həmi hər kəsin nə muradı olursa hasil olur, o birisi deyəcək ki, xeyr əstəğfurulla elə, Əshabi-kəhf deyilən o mağaradan ibarətdir ki, gün çıxandan batana kimi onun içindən işığını kəsməsin və həman mağara da bir rəvayətə görə Ərəbistanda Məkkə ilə Mədinənin arasında və bir rəvayətə görə Şam-şumun yaxınlığındadır. Bu deyib, o deyib bu çağırıb, o bağırıb 2-3 saat boğaz döyüşü və yaxayırtma edəndən sonra çıxıb dağılıb gedəcəklər işlərinə və genə Əshabi-kəhfin nərədə olduğu sübutsuz və dəlilsiz qalacaqdır.

Gəncəlilərin canına qurban olduğum Göy imama bakılıların Bibiheybətə, şamaxılıların Malakan pirinə və hacı Seyid Əli ağanın qəbrinə, şuşalıların Həzrət Abbas pirinə imanları kamil olduğu kimi naxçıvanlıların da Əshabi-kəhfə o dərəcədə ixlas və iradətləri kamildir. Hətta bu ilin içində iki nəfər bəy vəfat edəndə məxsusən vəsiyyət eləyibdirlər ki, bizim cənazəmizi aparıb Əshabi-kəhfdə dəfn eləyin tainki yeddi kimsənə olsun doqquz və qövm qəbilələri də aparıb oradaca basdırıblar və söz yox ki, indi onların ruhu cənnətdə rəhmət dəryasında üzür.

Bu cür pirlər və ziyarətgahlar Allaha şükür islam aləminin hər şəhərində və hər qəsəbəsində və hər kəndində və hər dağ başında vardır və ildə yüz minlər ilə azarlılar, kor və şikəstlər oralara zəvvar olub gedib sağalıb gəlirlər və daha yaxaları dinsiz, imansız urus həkimlərinin əlindən qurtarır. Müsəlman camaatının dünya və axirətdə də xoşbəxtliyi bir bu cür ocaqların və imamzadələrin bərəkətindəndir, bir Kərbala və Xorasan ziyarətinin nəzrindən və bir də məhərrəm və səfər aylarında şukuhlu və cəlallı təziyədarlıqdan. Çünki insan o şəxsə demək olar ki, onda təmiz ürək və saf qəlb dürüst etiqad olsun, yoxsa "gər bina şod etiqadət cümlə karət batil əst".

Kişidə ki, iman və etiqad olmadı bir qəpiyə dəyməz. Çox adamlar həqiqətdə etiqadsızlıqdan və imanı süstlükdən dünya və axirətdə zəlil və xar olurlar…

Bu cür ziyarətgahlarda və müqəddəs rövzələrdə ildə minlərlə möcüzələr və xariqüladələr olub necə ki, korların gözləri açılıb və şikəstlər sağlam olurlarsa habelə çox vaxt olur ki, gözlülər və sağlamilar şikəst olurlar. Bu da vaqiədə genə dəlildir onların etiqadlarının süstlüyünə ki, bəzi o cür müqəddəs yerlərə şəkk gətirirlər…

Mənim bu cür ziyarətgahlara həqiqətdə etiqadım kamildir. Amma məni həmişə şaşırdan bircə bu olur ki, bilmirəm niyə bəs bunlar acıqlarını bircə iranlılara tökürlər və həmişə çanaqları iranlıların başında çatlayır? Doğrudan necə ki, salarüddövlələr və rəşidülmülklər hər yerdə iranlını qırır, konsullar, nayiblər, fərraşbaşılar hər yerdə iranlını soyur, podratçılar, zavodçular, fabrikantlar hər yerdə iranlının pulunu kəsir, habelə də həmişə pirlər və ocaqlar biçara iranlıya qəzəb edirlər. İranın Sərab mahalında bir nəfər şəxs hüseyniyyə saxlayana bir müxtəsər rişxənd edən kimi fövri rəngi qapqara qaralıb ölüm halətinə düşür. Daha bu pirlər və bu rövzələr zalımlara, şəqilərə, xalqın qanını içənlərə qəzəb eləməyirlər ki, Allahın biçarə məxluqları onların zülmündən xilas olsun? Səməd xanları ki, nəinki bir müqəddəs rövzələrin, bəlkə bütün islamiyyətin ehtiramını götürür, cəzasına yetirməyirlər ki, başqalara ibrət olsun. Və o qəddar dəxi gün-gündən şəqavətin artırmasın?! Belə ki, bu günlərdə Tehrandan Təbrizə məclisə vəkil seçməkdən ötrü bir neçə nəfərin gəlməyini eşitcək hökm yazıb rastalara və dərbəndlərə yapışdırıbdır ki, hər kəs məclis intixabı barəsində bir kəlmə belə danışsa, onun başı fərmandadır və Tehran da həndəməndə danışsa Azərbaycanı büsbütün İrandan ayıracağam. Odur ki, yazıq əhali cınqırların belə çəkə bilməyirlər. Çünki çox şiddətli və bərk hökmdür və hökmün altında da öz möhrünü basıbdır, hansının ki, səci bu məzmundadır.

*Ara qali yan kənarə baş nəməd*
*Xersi-xuda quli-biyaban Səməd.*

*Sarsaqqulubəy*

## ƏŞ'AR

### GÖRÜRƏM

*(Xanəndə Məşhədi Məhəmməd Fərzəliyevə bənzətmə)*

*Dila, bu toyxanə içrə gəda görürəm,*
*Cəmi məstü mədhuş, bibəla görürəm,*
*Məarif işlərinə bir qəpik də verməzikən,*
*Burada pullarını çəngiyə fəda görürəm.*
*Cavanları hələ qalsın qıraqda, vallahi*
*Qocalarını olardan da xoş əda görürəm,*
*Teatr içrə şuluqluq salan hərifləri,*
*Burada qızlara valeh və bisəda görürəm.*
*Baxanda toyxananın sədrinə dilim quruyur,*
*Çiyində beşaçılan, sonra da əba görürəm.*
*Keçəndə toyxanadan yan otağə mat qalıram,*
*Qumar büsatını zira ki, cabəca görürəm,*
*Xülasə, Molla əmi, bir səni və bir də məni*
*Bu basəfa Bakıdan heyf kim cüda görürəm.*

*Əyyar*

### XIRDA-MIRDA XƏBƏRLƏR

**Buxarayi-şərif** – Kitab şəhrində olan Əbdülsəttar adlı bir şəxsin gözəl oğlu ki, neçə ay idi zor ilə gətirilib əmir Buxara həzrətlərinə pişxidmət təyin olunmuşdu, bu günlərdə cüzi nasaz olub rəngi qaçıb az-maz üzündə tük əlaməti zahir olduğundan əmirin dərbarından biryolluq qovulub onun vəzifəsi başqa bir xoşgül əmrədə tapşırıldı.

**ŞAMAXI** – Şəhər dumasında böyük şura olub qərar qoyulubdur ki, realni məktəbinin yerini Qorodskoy sada verib yanında da iki duxan bina elətdirsinlər. Çünki qlavanın və qlasnıların rəylərinə görə meyxana və gəzmək hər halətdə camaata məktəbdən xeyirlidir.

**NAXÇIVAN** – Nəcəfül-əşrəfdən Ağayi-Şeyx Məhəmmədəli Müctəhidi - Naxçıvaninin tərəfindən gələn 30 cild "Duati-Hüseyniyyə" kitabını camaat təntənəli surətdə alqışlayıb onun şərəfinə şəhəri başdan-başa çırağban etdilər. Əhali artıq dərəcədə şad və özlərini xoşbəxt hesab edirlər və deyirlər ki, ağanın bu kitabları ilə şəhərimizə cəmi xeyir-bərəkət nazil olacaqdır və bəylərin, xanların vıkup olunan yerlərinin pulları tez veriləcək ki, bundan artıq gecə gündüz skverin qabağında o başa, bu başa gedib ah çəkib qan udmasınlar və əsnaf üçün rəvaci-bazar olacaq ki, başları ticarətə qarışıb ənglərini boş qoyub axşama kimi onun-bunun qiybətini eləməsinlər və bir-birlərindən danos verməsinlər. Əkinçilər üçün su bolluğu olacaqdır ki, yaxaları şəhərin mirabının, cuvarının, starostasının əllərindən qurtarsın. Çünki kitablar çox müqəddəs və dərin kitabdırlar və başdan başa doludurlar səhih rəvayətlər və mötəbər hədislər ilə və hər bir səhifəsində məxsusən cənab Şeyx camaatı baş yarmağa, zəncir vurmağa, şəbeh gətirməyə və üz-gözlərinə palçıq yaxmağa dəlalət edir və tərğib və təşviq eləyir ki, adını şiə və dustar qoyan nəinki bir məhərrəm, səfər aylarını bəlkə il on iki ay gərək təziyədar olsun və baş yarsın. Çünki həzrət İbrahimin də Kərbəla çölündən keçəndə yıxılıb başı yarılıbdır.

*Müdir və baş mühərrirlər:*
*Cəlil Məmmədquluzadə, Əliqulu Nəcəfov*

### İXTAR

Məcmuəmizin şəhərlərdə olan vəkillərindən xahiş olunur ki, satdıqları jurnalların pulunu tamam kamal idarəyə göndərsinlər, tainki il axırına kimi hesablarımız bütün bütünə məfruq olsun və habelə nisyə jurnal alan ağalara da təvəqqə olunur ki, abunə bədəlini göndərsinlər, tainki 1914-cü ildə dəxi jurnal göndərməyə davam edək.

### ARVAD HƏKİMİ

*M.M.Binyamoviç*

Naxoşları qəbul eləyir gündüz saat 12-dən birə kimi, axşam 4-dən 6-ya kimi. Təmiz türkcə danışır. Velikoknyajski küçədə, 65 nömrəli ev, Kiroçni küçəninküncü camaat kitabxanasının qabağında.

*Электроп. Грузинск.*
*Изд.Товарищества Больш. Ванкская ул № 21*




*Xozeyin, Allah xatirinə ya xaçpərəst ol, ya müsəlman, həftədə ya cümə günü, ya bazar günü məni azad elə ki, dincimi alım…*

**Politexnikuma dair**

Erməni

ارمنی

Gürcü

گرجی

Rus

روس

Müsəlman

مسلمان

*Poqos xonaxa, gözün aydın olsun, politexnikum da Nəftluqda açıldı. Allah çox mübarək eləsin…*

**Adres:** *Tiflis, Davidov küçəsi nömrə 24.*
**Адресъ:** *Тифлисъ, Давидовская, 24.*
**Teleqram üçün:** *Tiflis, "Molla Nəsrəddin".*
**Для телеграмм:** *Тифлисъ, "Молла Насреддинъ".*
***Подписная цена:***
***На годъ - 6 руб.***
***6 месяц - 3 р. 50 к.***
***3 месяц - 2 р.***
***1 месяц - 40 к.***
Adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

**Qafqazda və Rusiyada**
**12 aylığı - 6 manat**

"-----------------------" 6 aylığı - 3 manat yarım
"-----------------------" 3 aylığı - 2 manat
"-----------------------" 1 aylığı - 40 qəpik
*Əcnəbi məmləkətlərdə 12 aylığı - 7 manat*
"-----------------------" 6 aylığı - 4 manat

***Tək nüxsəsi idarəmizdə 10 qəpik, özgə şəhərlərdə 12 qəpik.***

## 1914-CÜ İL ÜÇÜN ABUNƏ DƏFTƏRİMİZ AÇILDI

Oxucularımıza məlumdur ki, biz müsəlmanların içində on üç sayı adət üzrə nəhs hesabdandır və həmişə bizim müsəlman qardaşlar qoz, qarpız, kələm və qarğıdalı sayanda elə ki, on iki keçdi, on üç deyil deyərlər. Əxbarda hədisdə də varid olubdur ki, ənnufusu kənnusus, yəni o şeylər ki, bizlərin içində nüfus hesab olunur nəs hökmündədirlər, onları gərək heç bir vaxt tərk etməmək. Bizlər ata-babadan qalan o cürə gözəl adətlərə, nüfuslara inanmamışıq və əməl etməmişik ki, indi xeyir bərəkət bizim içimizdən bütün bütünə götürülübdür.

Biz həqiqətdə on üç sayının nəhs, tərs və çəlpəşik bir hesab olduğuna qayil olsaydıq bu 1913-cü ildə əsla jurnal çıxartmazdıq və necə ki, 1912-ci ildə doqquz ay tətil etmişdik, bir il dəxi dübarə tətil eləyib bu üzümüzə gələn 1914-cü ildə "Molla Nəsrəddin"i nəşrə başlardıq və daha bu qədər keşməkeş və qəzavü qədərə giriftar olmazdıq. 1913-cü ildə biz işə şüru elədik ki, 16 və 21-ci nömrələrimiz hökumət tərəfindən müsadirə olunub özümüz də külli-xəsarətə düşüb təhti-mühakiməyə alındıq!.. Həmin bu nəhs və tərs ildə jurnal çıxartdıq ki, cəmali-mübarəkin batini bizi vurub hər tərəfdə protestlərə, tənələrə və təhdidlərə düçar olub okrujnoy sudlara çəkildik, başımıza ənvai-müsibət gəldi və bunların hamısı ilən sabit olundu ki, biz böyük bir səhv etmişik və ata-baba yolundan azıb masoni məzhəb olmuşuq!!

İndi iş işdən keçib, daldan atılan daş topuğa dəyər. Gərək qarelərimiz özləri bizim jurnalın bu ilin içində axsaya-axsaya, qaydasız və tərtibsiz çıxdığını bağışlayıb və gözlərini yumub üç salavat çevirib on üç deyil deyəndən sonra, bizim bu nəhs ildə işə şüru eləməyimizi və bizdən bu böyüklükdə tərki-ədədi baş verməyini məzur tutsunlar. İnşallah 1914-cü ildə jurnalımız münəzzəm və müntəzəm bir surətdə hər həftədə çıxıb müştərilərimizi razı və xoşbəxt buraxacaqdır.



Qüvvətli ümidimiz vardır ki, oxucularımız bizim səkkiz ildə sərf olunan əməyimizi nəzərdə tutub şövq və həvəs ilə öz müştəlilərində davam edəcəklər və şəhərlərdə olan vəkillərimiz dəxi satdıqları jurnalın pullarını vaxtlı-vaxtında idarəyə yetirəcəklər və razı olmayacaqdılar ki, onlar jurnal pulunu noxud kişmişə verib, yeyib ağızları şirin olduğu halda "Molla Nəsrəddin" heyəti-təhririyyəsinin ağzı Əbu Cəhl qarpızının dadını versin!...

*İdarə*

### DƏYƏNƏK

*Bir mühərrir ki, eyib-nöqsanı*
*Yazdığı cümlədə pədid olsun.*
*Qanmasın bir sözün həqiqətini*
*Anlamaq şəninə bəid olsun.*
*Saxlasın Mir Muxammedin tərəfin,*
*Canü dildən ona mürid olsun.*
*Əcəba böylə bir şəqavət ilə*
*Yaraşarmı adı Səid olsun?!*

*Cüvəllağıbəy*

### ORDUBAD BOZBAŞI

*Keçən nömrənin axırı*

Fransa inqilabının şirin vaxtında, Paris küçələrində Russoların cızmaqaraları, Volterlərin həcviyyatı oxunub alqışlanan vədələrdə bir filosof da dünyaya gəldi. Onun adı Oqyus Kont idi. Bu da bir cürə havacat oxuyurdu. Bu deyirdi ki, üsuli-idarəni zorla bir millətə və ya qövmə yapışdırmaq olmaz. Gərək millət öz tərəqqisinin dərəcəsinə görə özünə idarə tapa.

Mənim bunlarda işim yoxdur, mən ancaq bir şeyə təəssüf eləyirəm ki, niyə həmin filosof sağ deyil və ya İran inqilabı bir heylə həkim yetirmədi ki, göreydik İrana və yaxud Azərbaycana nə cür idarə lazımdı? Bir Təbrizdə neçə hökumət var:

Səməd xan, Rəşidülmülk, Mirzə Həsən, Mirzə Kərim, Müsyö Lajin və hakəza və hakəza... Hər təbrizlini dindirsən bunların hər birisinin ömrünə dua oxuyur və Tehrana da uzun teleqraflar çəkilir ki, bizə məşrutə lazım deyil. Amma bir üç il bundan qabaq əllərində tüfəng bu adamları şəhərə qoymayırdılar və bir Mirza Ağa İsfəhani kimi yalançıq məşrutəçi Təbrizə gələndə bütün şəhər əhli məmədeyəndən pəpəyeyənədək Acı körpüsünə kimi onu pişvaz eləyirdilər.

Heç kəs danmaz ki, qəzavü qədər yoxdur. Annımıza nə yazılıbsa o olacaqdır. Kimin hünəri var desin inanmıram. Yazım Bakıya təfsiri-Quran sahibi bütün "İqbal" heyətinin küfrünün fitvasını versin! - Buna qəzavü qədər deyərlər ki, gərək Abbas Mirza kimi nayibüssəltənələr ölüb yerində Məhəmməd şahlar və Nasirəddinlər qalaydılar ki, vətənlərini bu cür abad eləyəydilər. Mirzə Təqi xanların, Müşirüddövlələrin yerində gərək Ətabəklər, Daneşlər qalaydılar ki, İranı bugünkü tərəqqi və səadətdə görəydik. Allah Mirzayi Şiraziyə, Məməqaniyə və Hacı Mirzə Cavada rəhmət eləsin. İndi bir kişi axtarıram ki, gedib bunların qəbrini tapıb bir həmdü surə oxuyandan sonra qəbirlərin taqqıldadıb bir bunu deyə ki: ey mərhumlar, ey bir tənbaku məsələsindən ötrü bütün Tehranı və İranı bir-birinə vurub va millətə, va şəriata çağıranlar! Gözünüzü bir açın! Siz nəcis hesab etdiyiniz xaricilər, indi iranlılara nəcis yedirdirlər...

Ordubad bozbaşı çox ətirli xörəkdir. Amma Oksford darülfünunu da Avropanın ən məşhur və ən birinci darülfünunlarındandır. Oradan çıxan lord kerilər, lord kirzonlar, bütün dünyanın siyasətini əllərinə alıb o yan bu yana çevirirlər. Amma hər kəsin alnında nə yazılıb o olacaq, hər oxuyan Molla Fətulla olmaz. Dünya da beş günlükdür. Adama istirahət lazımdır. İnsaf da deyil ki. Londonun bivşteksini, Parisin şatobriyanını və cürbəcür rahatçılıqları qoyub gəlib Ordubad bozbaşının qoxusunu çəkəsən!..

*Lağlağı*

### QƏDİR ANLAMAQLIQ

İyirminci əsrin əvvəllərində
- Düşmüşdü millət bir qəmli halə
Cəhlin livası islam əlində
- Yetmişdi vəhşət həddi-kəmalə.

*Xozeyin! Cənab müstətab əcəll əkrəm əzəm Ağayi-Hacı Mirzə Hüseynqulu xan əşşəhir be Qürrət əlmüləqqəb be Siracülməmalik üçün mənzil lazımdır.*



*Mehmanxanaçı - Bağışla qardaş, o qədər adama bizim nömrədə yer olmaz.*

*Şəlaləçilərin iqdamati-nisvanpərvəranəsi*




*Qoyma üzün açsın nisvan başlarını qat*
*Daşdan qayadan hər nə gəlir başla dığırlat.*




*Məşədi Hüseyn usta! Mənə bir yaxşı xət qoy 150 manata danışmışam gedib Soğanlıqda tərəkəmə içində mərsiyə oxuyacağam.*



*Pərvərdigara! Mənim əhli-əyalımın boğazlarını daralt tainki, az xörək yesinlər. Xudavənda cəmi ac və çılpaqlara vəba və taun göndər ki, həlak olsunlar.*

Farsın qapazı türkün sərində - millət gedirdi dilsiz zəvalə
Erabi-zəngin dil əllərində - soxmuşdu türkü bir dar çuvalə
Qafqaziyanın islam elində - donmuş əhali bənzərdi lalə,
Söyləməz idi, söz türk dilində - türkcə alınmaz olmuşdu qalə
Osmanlılardan bir türk zində - imdada qoşdu işbu məhalə
Doğdu günəştək zülmət içində - parlatdı bir nur adı "Şəlalə"
Bir caddə açdı dil barəisndə - kim gəlməz idi hərgiz xəyalə
Bir dil yaratdı çox incə sadə - həm əlverişli Şərqə, Şimalə
Aləmi küllən qıldı izalə - əhsən "Şəlalə", ax sən "Şəlalə"!

Keçmişdi keçmiş dönmüşdü dövran - azmışdı yoldan yeksər cəmaət
Sarsaqlamışdı bir çox müsəlman - getməkdə idi əldən dəyanət
Adəm yox idi boş idi meydan - mollayə cahil eylər ihanət
Fikr özgələşmiş işlər pərişan - tərk eylənirdi hali-bədavət
Qızlar güşadə eylərdi cövlan - Çarşaf nə üzlük, nə şərmi-ismət.
Məktəb, kitabət, təlimi-nisvan - ziddi-şəriət, bərəksi-adət
Molla və seyyid bəyzadə və xan - ağlar, qopardılardı qiyamət
Söz anliyan kim? yüz də qıl əfqan - azadə hər kəs məsti-cəhalət.
Yanmaqda ikən bu günə hər yan - qılmazdı bir kəs buna dəxalət
Məşriqdən oldu bir əl nümayan - barmaqlarında bir altun alət
Bəyzadə Xalid bir xalis insan - şər'i-şərifi qıldı siyanət
Mövtaya verdi İsa piyalə - Əhsən "Şəlalə", ax sən "Şəlalə"!

Verdi tərəqqi ayinə Xürrəm - bir aşiqi-həqq bir hamiyi-din
Yoldaşı Həqqi ağayi-əzəm - Allahlı alim mərdi-nikubin
Dəxi iki, üç şəxsi mükərrəm - təni ədudən el namu rəsmin
Bağladılar bu zəxm üzrə mərhəm - bunlara dünya göndərdi təhsin
Azğınlara üz verdi böyük qəm - payları oldu lənətü nifrin
Başı aşağa qamətləri xəm - mömin kişilər həp buldu təskin.
Qalxızdılar səs, atdırdılar rəm - qız məktəbində qalmadı bir cin.
Cinlər uçuşdu şeytanlar ol dəm - millət içinə püflədilər kin
Göstərdilər yol cəngü cidalə - əhsən "Şəlalə" ax sən "Şəlalə"!
İsməü əfhəm, isməü əfhəm - el, yurd, ayin getsə zəvalə
Baxma ona sən yaz bir məqalə - ol bais oğlum şərrə qitalə
İnsan deyil ki, qızlar, qadınlar - basdır hicabə gizlət çuvalə
Qəsb et hüququn qır ehtiramın - Ağlaşsın onlar, gülsün "Şəlalə"
Öyrənməsin iş, uymasın elmə - Bərk tut, buraxma batsın həramə.

*Keyfiz*

**Teleqraf xəbərləri**

Təbriz - Talibiyyə və Sadiqiyyə (universitet) darülünunlarının studentləri manevraya çıxıb şiddətli surətdə atışdılar, rəvayətə görə bunlar indidən hazırlaşırlar ki, gələcəkdə Tehran hökuməti ilə Təbriz hökumətinin arasında vaqe olan cəngi-məğlubədə hacı Mirzə Həsən ağanın təhti-komandasında böyük hünər və rəşadət göstərsinlər.

**ŞAMAXIDAKI DOSTUMA**

Millətə hər kəs olsa xidmətkar
Millətindən cəzası, əcri çatar
Əzilər baş-gözü düşər kötəyə
Bizdə adətdi bu gözəl rəftar
Oldu hörmətlilik hər yerdə
Elbələrtək qotur, kifir, kaftar.

*Cüvəllağıbəy*

**TÖHFƏ**

Bir müsəlman hamamının övrət müştərisi deyir ki:

Bəslənib çünki zibilgahda daim bədənim
O səbəbdəndi düşüb çirkaba bu canütənim
Qıçıma gər dolaşa əlli sajın baş tükü
Çıxmaram mən bu hamamdan vətənimdir, vətənim.

*Həqq*

**NÜMUNEYİ-ƏDƏBİYYAT**

İdarəmizə gələn şeirlərdən nümunə:

**MÜXƏMMƏSÇİLƏR**

Molla dayı işbu müxəmməsçilər
Yazmadadır şövqə gəlib şerlər
Görsə bu əşarı Füzuli əgər
Məncə onun qailini həcv edər
Şer yükündən düzülüb qafilə

Hey yazılır, hey pozulur nafilə,
Səfheyi-iqbal dönüb dəftərə
Şerə yazır onda yetər məsxərə
Xalqa müdiri veriyor məzvərə
Biz də gərək ondan edək ğərğərə
Məndən əgər olsa çəkib kəndirə
Çırpı yerinə ataram təndirə.
Şer ilə İran kimi bir məmləkət
Verməd övladına bir mənfəət
Çəkdi göyə özgələri mərifət
Qıldılar ehrazi-kəmali-sifət
Mən kimi hər bambılı hər bisavad
İstər ala şer deməklikdən ad.

*Simurğ*

## YAT

Açma gözünü sübh deyil durma şirin yat
Get xabə dərin yat
Yat bəlkə düşə cənnətə sarı güzərin yat
Get xabə dərin yat
Huriləri yığ başına qılman qucağında
Hər şey bucağında
Hökmün yerisin onlara saxla qabağında
Çoxlu boğuş onlar ilə qəsrin otağında
Qalsın qulağında
Bir gənc kimi keyf elə həştad çağında
Bitli yatağında
Yoxdur ki, sənin bundan əlavə hünərin yat
Get xabə dərin yat
Şirindi yuxun, istidi, əlbəttə yerin yat,
Get xabə dərin yat

*İlanoynadan*

## DİNC OTUR

Molla gəlibsən genə ha, dinc otur,
Lal oluban çəkmə səda, dinc otur
Millətimiz indi uyur qəflətə
Rəhm edəlim yazmagilən övrətə
Dərd-sər olma mən ölüm millətə
İşlər olar çünki fəna, dinc otur
Dərs oxusa Fatma xala, dinc otur.

*Mirzə Qoşunəli*

## İXTAR

"Molla Nəsrəddin" jurnalını satıb pullarını cibişdana doldurub göndərməyən vəkillərimizə açıqdan-açığa itmami-höccət edirik ki, hərgah bu tezlikdə borclarını idarəyə göndərib məfruq hesab etməsələr gələcəkdə onların adlarını məcmuəmizdə kəmali-ehtiram ilə yad edəcəyik, tainki onların kim və necə sahibi-etibar və düzgün olduqları ümum qarelərə məlum olsun.

*Müdir və baş mühərrirlər:*
*Cəlil Məmmədquluzadə, Əliqulu Nəcəfov*

## İXTAR

Məcmuəmizin şəhərdə olan vəkillərindən xahiş olunur ki, satdıqları jurnalların pulunu tamam-kamal idarəyə göndərsinlər, tainki il axırına kimi hesablarımız bütün-bütünə məfruq olsun və habelə nisyə jurnal alan ağalara da təvəqqe olunur ki, abunə bədəlini göndərsinlər tainki 1914-cü ildə dəxi jurnal göndərməyə davam edək.

## ELANLAR

**"ŞƏHBAL"** - On beş gündə bir dəfə nəşr olunan ədəbi, elmi məcmueyi-müsəvvərədir. Məmaliki-əcnəbiyyə üçün sənəlik abunəsi bir ingilis lirası (təqribən on dörd rublə) altı aylığı beş rublədir və türk aləmində və türk mətbuatının içində birinciliyi ehraz edən bu məcəllənin almasını bilxassə qarelərimizə tövsiyə ediriz.

Adres: *İstanbul, yeni poçtxana qarşısında Fərruxbəy xanında, nömrə 12, 109.*

**"TƏRCÜMAN"** - Siyasi ədəbi ictimai milli gündəlik "Tərcüman" qəzetinin 1914-cü il üçün abunə dəftəri açıldı. Sənəlik bədəli 5 rublə, altı aylığı 2 rublə 50 qəpikdir.

Məhəlli-idarəsi, şəhri-Bağçasaray (Rusiya).

**"Vəqt"** - Siyasi ədəbi gündəlik "Vəqt" qəzetinə 1914-cü il üçün abunə dəftəri açıqdır. İllik bədəli 5 sum, altı aylığı 2 sum 60 tiyindir. İdarəsi Orenburq şəhərində.

**"İQBAL"** - hər gün nəşr olunan ədəbi, fənni, siyasi, ictimai iqtisadi "İqbal" qəzetinə 1914-cü il üçün abunə dəftəri açıqdır… İlliyi 6 rüblə, altı aylığı 3 rüblə 50 qəpikdir.

Məmaliki-əcnəbiyyə üçün illiyi 12 manat, altı aylığı 7 manatdır.

**Adres:** Bakı, Poçta qutusu 259, Bəradərani-Orucov.

*Электроп. Грузинск. Изд.*
*Товарищества Больш. Ванкская ул №12*




*Həzərat, mən sizi inandırıram ki, tarixi-islamı xarici dilində oxumasaq bizə mədrəseyi-ruhaniyyə açmağa əbədən izin verilməz.*